# Əhli-beytlə səhabələr arasında qarşılıqlı tərriflər

**Hazırladı:** Əhli-beyt və səhabələr adına xeyriyyə fondunun nəzdində olan tədqiqatlar və araşdırmalar mərkəzi

**Tərcümə edən: Əbu Zəkəriyyə**

**Pak əhli-beyti və xeyirxah səhabələri sevənlərə ithaf olunur**

# Müqəddimə

Həqiqətən də həmd yalnız Allaha məxsusdur, biz Ona həmd edir, Ondan yardım diləyir və Ondan bağışlanmağımızı istəyirik. Nəfsimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allahın hidayət verdiyi kəs hidayətə varmışdır. Onun azdırdığı kəsi isə doğru yola yönəldən tapılmaz. Şəhadət verirəm ki, Allahdan başqa ibadət haqqına malik məbud yoxdur və Muhəmməd ﷺ Onun qulu və elçisidir.

Öz kitabında aşağıdakıları buyuran Uca Rəbbimizə həmd olsun:

**"Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar.** ***Allah*** **onlar üçün altından çaylar axan, içində əbədi qalacaqları cənnətlər hazırlamışdır. Bu, böyük uğurdur."[1]**

Məgər səhabələri bu cür tərif etdikdən sonra Onun tərifindən artıq tərif, razılığından artıq razılıq ola bilərmi? Uca Allah onlara gözəl bir tərzdə tabe olmağı Özünün razılığı və hidayəti olaraq buyurmuşdur.

Tarixi saxtalaşdırmağa cəhd edən bəziləri iddia edirlər ki, guya Peyğəmbərin ﷺ səhabələri ilə əhli-beyti arasında düşmənçilik mövcud olub. Əslində isə onların halı ayədə buyurulduğu kimi idi: **"Onunla birlikdə olanlar kafirlərə qarşı sərt, öz aralarında isə mərhəmətlidirlər."[2]**

əl-Hədid surəsində isə buyurur: **"Sizə nə olub ki,** ***malınızdan*** **Allah yolunda xərcləmirsiniz? Halbuki göylərin və yerin mirası Allahındır. Sizlərdən** ***mallarını Məkkənin*** **fəthindən əvvəl xərcləyib döyüşənlər** ***başqaları ilə*** **eyni deyillər. Onların dərəcəsi** ***mallarını fəthdən*** **sonra xərcləyib döyüşənlərdən daha üstündür. Am-**

---

[1] ət-Tovbə surəsi, 100

[2] əl-Fəth surəsi, 29

**ma Allah onların hamısına ən gözəl olanı vəd etmişdir. Allah sizin nə etdiklərinizdən xəbərdardır."**[1]

Məgər İzzət və Cəlal Sahibi olan Allah vədinə xilaf çıxa bilərmi? O, belə buyurur: "**Siz insanlar üçün üzə çıxarılmış ən xeyirli ümmətsiniz."**[2]

Məgər Allahın bu ayəsini və rəsulunun aşağıdakı hədisini yalan sayan kəs müsəlman sayılarmı?

Peyğəmbər ﷺ buyurmuşdur: "Ümmətimin ən xeyirliləri mənim əsrimdə yaşayanlar, sonra da onlardan sonra gələnlərdir."[3]

Görəsən səhabələr və əhli-beyt رضي الله عنهم hamıdan erkən islamı qəbul edən, ən xeyirli qövm, mühacir, ənsar və yer üzünü fəth edən qəhrəmanlar deyildilərmi? Görəsən bir-biriləri ilə birlikdə eyni yolun yolçuları olmayıblarmı? Allaha and olsun ki, onların arasında sevgi, hörmət və xoş münasidətdən başqa bir şey olmamışdır. Hamıya məlumdur ki, onlar bir-biriləri ilə qohum olmuş, bir-birilərindən qız alıb vermiş və İslam dinini ucaltmaqda, aləmlərin Rəbbinin rəsuluna kömək etməkdə və batil inanclı düşmənlərə qarşı döyüşlərdə birgə iştirak etmişlər. Onların hamısı mötəbər şəxslər olmuşlar. Ağlı başında olan və dininə həris olan kəs özünə hörmət edərək onların arasında baş verənlərə qarışmamalı və bu fitnədən uzaq durmalıdır.

Kitabın növbəti bölmələrində səhabələrlə əhli-beytin رضي الله عنهم bir-birilərinə bəslədikləri sevgi və hörməti bir daha təsdiq etmək üçün onların arasında olan qarşılıqlı tərifləri özündə əks etdirən hədis və rəvayətləri sizə təqdim edəcəyik. Əslində bu belə də olmalıdır. Çünki səhabələr Qədirxumda[4] Peyğəmbərin ﷺ əhli-beyt barəsində buyurduğu bu vəsiyyətinə əməl edirdilər: "Əhli-beytimə (hörmət etməyi) sizə xatırladıram, Əhli-beytimə (hörmət etməyi) sizə xatırladıram."[5] O, bu sözləri üç dəfə təkrar etdi.

---

[1] əl-Hədid surəsi, 10

[2] Ali-İmran surəsi, 110

[3] əl-Buxari "Səhabələrin fəzilətləri" kitabı, "Peyğəmbərin ﷺ səhabələrinin fəzilətləri" fəsli № 3650, 3651

[4] Məkkə ilə Mədinə şəhərləri arasında yer adı

[5] Səhih Muslim, "Əli ibn Əbu Talibin رضي الله عنه fəzilətləri" fəsli № 2408

Əhli-beyt də öz növbəsində səhabələrin din yolunda əvəzsiz işlər gördüklərini, ailə və uşaqlarını buraxıb, Allahın dini naminə hicrət etdiklərini, dinə yardım etdiklərini və aləmlərin Rəbbinin Peyğəmbərinə ﷺ kömək etdiklərini yaxşı bilirdilər.

Allah həm bizə, həm də sizə onları sevməyi, onlara tabe olmağı və Uca Firdovs cənnətlərində Peyğəmbərlə ﷺ və onlarla birlikdə olmağı nəsib etsin... Amin.

# Birinci fəsil
# Əhli-beyt və səhabələr kimlərdir?

## Əhli-beyt kimlərdir?

Bu məsələ barəsində alimlər müxtəlif fikirlər səsləndirmişlər. Lakin daha üstün rəy ondan ibarətdir ki, Əhli-beyt deyildikdə Haşimi övladları nəzərdə tutulur. Çünki sədəqə almaq onlara haram buyurulmuşdur[1]. Muslim "Səhih" əsərində Zeyd ibn Ərqamın ﵁ belə dediyini rəvayət etmişdir: "Bir gün Rəsulullah ﷺ Məkkə ilə Mədinə şəhəri arasında Xum adlanan yerdə bizə xütbə verdi. O Allaha həmd sənalar etdikdən sonra bizə moizələr verib *bəzi şeylər* xatırladı, sonra da belə buyurdu: "Ey insanlar! Şəkk yoxdur ki, mən də bir insanam. Ola bilsin ki, Allah öz elçisini (mənim canımı almaqdan ötrü) göndərsin və mən də ona tabe olum. Sizə iki şeyi qoyub gedirəm. Onlardan birincisi Allahın kitabıdır, onda hidayət və nur vardır. Ona əməl edərək ondan möhkəmcə yapışın." Beləcə o, insanları Allahın kitabına təşviq etdikdən sonra buyurdu: "Allah xatirinə əhli-beytimi də sizə tapşırıram, Allah xatirinə əhli-beytimi də sizə tapşırıram, Allah xatirinə əhli-beytimi də sizə tapşırıram." Hədisin ravilərindən biri Husayn soruşdu: "Ey Zeyd! Peyğəmbərin ﷺ əhli-beyti kimlərdir? Məgər onun xanımları əhli-beytdən deyillərmi?" O dedi: "Bəli, Peyğəmbərin ﷺ xanımları da əhli-beytdəndirlər. Lakin ümumən əhli-beyt deyildikdə Peyğəmbərdən ﷺ sonra özlərinə sədəqə qəbul etmək haram buyurulmuş kəslər nəzərdə tutulur." O, yenə soruşdu: "Onlar kimlərdir?" O, dedi: "Əlinin ailəsi, Əqilin ailəsi, Cəfərin ailəsi və Abbasın ailəsi…"[2]

Başqa bir dəlil odur ki, Abdulmuttalib ibn Rabiə ibn əl-Haris ibn Abdulmuttəlib və Fadl ibn Abbas ﵄ Peyğəmbərin ﷺ yanına gəlib evlənmək üçün sədəqə almalarına icazə istədikdə Peyğəm-

---

[1] Kim bu məsələnin təfsilatına varmaq istəyirsə əs-Səxavinin "İrtiqa əl-Ğuraf" əsərinə (səh. 127) baxsın

[2] Muslim, "Səhabələrin fəzilətləri" kitabı, "Əlinin fəzilətləri" fəsli № 2408

bər ﷺ onlara belə cavab verdi: "Şübhəsiz ki, sədəqə insanların artığıdır. Bu isə Muhəmmədin ailəsinə yaraşmaz."[1]

Bu dəlillərə əsasən Əlinin, Cəfərin, Əqilin, Abbasın, Əbu Ləhəbin, Haris ibn Abdulmuttalibin övladları kimi, Peyğəmbərin ﷺ İslamı qəbul etmiş bütün əmisi oğulları, Peyğəmbərin ﷺ əhli-beytindəndirlər.

## Peyğəmbərin ﷺ xanımları da əhli-beytdəndirlər

İzzət və Cəlal Sahibi olan Allah buyurur: **"Evlərinizdə qərar tutun! İlk cahiliyyə dövründə olduğu kimi açıq-saçıq gəzməyin. Namaz qılın, zəkat verin, Allaha və Onun Rəsuluna itaət edin. Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir."[2]** Ayə açıq-aşkar xanımların əhli-beytdən sayıldıqlarını göstərir. Lakin bu yalnız onların əhli-beytdən sayılmaları anlamında deyil. Sadəcə bu məqamda onlar xüsusi olaraq qeyd olunurlar.

İkrimə rəvayət edir ki, İbn Abbas رضي الله عنهما bu ayə barəsində belə demişdir: "Bu ayə Peyğəmbərin ﷺ xanımları barəsində nazil olunmuşdur." Sonra İkrimə dedi: "Bu ayələrin Peyğəmbərin ﷺ xanımları barəsində nazil olunması xüsusunda kim istərsə onunla lənətləşərəm."[3]

İbn Qeyyim Peyğəmbərin ﷺ xanımlarını əhli-beytdən sayanların dəlillərini gətirərək bu fikiri "Cəla əl-Əfham" əsərində (səh. 331-33) zikr etmiş və demişdir: "Ayədə Peyğəmbərin ﷺ xanımları xüsusi olaraq qeyd olunur, çünki onlar Peyğəmbərlə ﷺ bilavasitə qohumdurlar. Peyğəmbərin ﷺ istər sağ ikən, istərsə də vəfat etdikdən sonra xanımlarının başqalarına ərə getmələri haramdır.

---

[1] Muslim, "Peyğəmbərin ailəsinə sədəqədən istifadə etməyin qadağan olunması" fəsli № 1072

[2] əl-Əhzab surəsi, 33

[3] "Siyər Əlam ən-Nubələ" əsəri, 2/208. Kitabı təhqiq edən alim rəvayətin həsən olduğunu bildirmişdir

Onlar Peyğəmbərin ﷺ həm bu dünyada, həm də axirətdə xanımları sayılırlar. Səbəb isə onlarla Peyğəmbərin ﷺ arasında olan əlaqənin nəsəbə görə qohumluq əlaqəsi sayılmasıdır. Peyğəmbər ﷺ onlara salavat deməyi tövsiyə etmişdir. Bu səbəbdən də düzgün rəy – İmam Əhmədin dediyi kimi – sədəqənin onlara haram olmasıdır. Çünki Uca Allah bu pak adamları insanların artığından yüksəkdə tutmuşdur."

Çox qəribədir! Necə ola bilər ki, aşağıdakı hədislərə Peyğəmbərin ﷺ xanımları şamil olunsun!?

Peyğəmbər ﷺ demişdir: "Allahım Muhəmmədin ailəsinin ruzisini onları doyduracaq qədər et."[1]

Qurban barəsində isə belə demişdir: "Allahım bu Muhəmməd və onun ailəsinin adındandır."[2]

Aişədən رضي الله عنها rəvayət olunur ki, "Muhəmmədin ﷺ ailəsi heç vaxt buğda çörəyindən doyunca yeməmişdir."[3]

Habelə Peyğəmbər ﷺ demişdir: "Allahım Muhəmmədə və onun ailəsinə xeyir-dua ver."[4]

Amma bu hədisə onun xanımları şamil olunmasın?

"Şübhəsiz ki, sədəqə Muhəmmədə və onun ailəsinə haram buyurulmuşdur."[5]

Halbuki, Peyğəmbərin ﷺ xanımlarının insanların artığından uzaq olmaları daha məqsədəuyğundur.

Birdən desələr ki, əgər sədəqə Peyğəmbərin ﷺ xanımlarına haramdırsa onda gərək onların azad etdikləri kölələrə də haram

---

[1] Hədisi Muslim "Zəkat" kitabında, "Dolanışıq üçün ğərəkli olan ərzaqlar və aza qane olmaq" fəslində (№ 1055) Əbu Hureyrədən رضي الله عنه rəvayət etmişdir

[2] Əbu Davudun "Sünən" əsəri, "Həccin ayinləri" kitabı, "Saçları yapışqan bir maddə ilə yapışdırmaq" fəsli № 1750. Şeyx Albani bu hədisi "Səhih" hesab etmişdir

[3] Bu hədis Buxarinin "Səhih" əsərində, "Yeməklər" kitabının "Peyğəmbərin ﷺ və onun əshabələrinin yedikləri" fəslində bu ləfzə yaxın mənada rəvayət edilmişdir № 5416. Muslimin "Səhih" əsəri, 2970.

[4] Buxarinin "Səhih" əsəri, "Təfsir" kitabı, "Doğrudan da, Allah və Onun mələkləri Peyğəmbərə xeyir-dua verirlər" fəsli № 4797

[5] Muslim № 1072

olsun. Necə ki, Haşim oğullarına sədəqə haram olduğu üçün, onların azad etdikləri kölələrə də haram oldu. Amma Səhih hədisdə rəvayət olunur ki, Aişənin رضي الله عنها mövlası (azad etdiyi köləsi) Bəriraya sədəqə olaraq ət verilmiş, o da onu yemişdi. Peyğəmbər ﷺ isə bunun haram olduğunu ona söyləməmişdi.

**Cavab:** Əslində bu Peyğəmbərin ﷺ xanımlarına sədəqə yeməyi caiz görənlərin gətirdikləri bir şübhədir. Bunun cavabı odur ki, Peyğəmbərin ﷺ xanımları Peyğəmbərin ﷺ kökündən olmadığına görə sədəqə onlara birbaşa haram olmamışdır. Sədəqə onlara sadəcə Peyğəmbərə ﷺ haram olduğu üçün haram olmuşdur. Axı Peyğəmbərlə ﷺ ailə qurmamışdan öncə onlara sədəqə halal idi. Deməк Peyğəmbərin ﷺ xanımları bu qadağanın bir qoluna aiddirlər. Azad olunmuş kölələrin ağalarına nəyinsə birbaşa haram olunması həmin kölələrə də şamil olunur. Çünki onlar da bu qadağanın bir qoluna aiddirlər. Odur ki, Peyğəmbərin ﷺ kökündən olduqlarına görə Haşimi oğullarına sədəqə birbaşa haram buyurulduğu üçün bu haramlıq onların azad etdikləri kölələrə də aid edilir. Amma Peyğəmbərin ﷺ xanımlarına sədəqə Peyğəmbərə ﷺ görə haram olduğu üçün bu haramlıq həmin xanımların azad etdikləri kölələrə aid edilmir. Çünki bu həmin qadağanın qolunun qolu hesab edilir.

Uca Allah buyurur: **“Ey Peyğəmbərin zövcələri! Sizlərdən hər kim açıq-aşkar bir çirkin iş görsə, onun əzabı ikiqat artar. Bu, Allah üçün asandır. Sizlərdən hər kim Allaha və Onun Rəsuluna itaət edib yaxşı işlər görsə, ona mükafatını ikiqat verərik. Biz onun üçün bol ruzi hazırlamışıq. Ey Peyğəmbərin zövcələri! Siz hər hansı bir qadın kimi deyilsiniz. Əgər *Allahdan* qorxursunuzsa, *yad kişilərlə* nazlana-nazlana danışmayın, yoxsa qəlbində xəstəlik olan kəs tamaha düşər. *Şəriətə* müvafiq qaydada danışın. Evlərinizdə qərar tutun! İlk cahiliyyə dövründə olduğu kimi açıq-saçıq gəzməyin. Namaz qılın, zəkat verin, Allaha və Onun Rəsuluna itaət edin. Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir. Evlərinizdə oxunan Allahın**

**ayələrini və hikməti yada salın. Həqiqətən, Allah Lütfkardır,** ***hər şeydən*** **Xəbərdardır."**[1]

Bu ayələrdən bəlli olur ki, Peyğəmbərin ﷺ xanımları əhli-beytdən sayılırlar. Çünki ayələrdəki xitabların hamısı onlara olunur. Odur ki, onları ayələrdəki xitabların heç birindən kənarlaşdırmaq olmaz. Daha doğrusunu isə Allah bilir." İbn Qeyyimin sözləri burada bitir. Güman edirəm ki, onun sözləri kifayət edir.

**Əhli-beytin müxtəlif fəzilətləri və çoxlu sayda üstünlükləri vardır. Onlardan bəziləri bunlardır:**

Uca Allah öz kitabında buyurur: **"Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir."**[2]

Muslimin "Səhih" əsərində Yəzid ibn Hibbanın belə dediyi rəvayət olunur: "Bir dəfə mən, Husayn ibn Sibrə və Ömər ibn Məsləmə ilə birlikdə Zeyd ibn Ərqamın رضي الله عنه yanına getmişdik. Gəlib onun yanına əyləşdikdə Husayn ona dedi: "Ey Zeyd, sən bir çox xeyrə nail olmusan. Peyğəmbəri ﷺ görmüsən, onun söylədiklərini dinləmisən, onunla birlikdə vuruşmuş və arxasında namaz qılmısan. Ey Zeyd sən bir çox xeyirə nail olmusan. Nə olar bizə də Peyğəmbərdən ﷺ eşitdiklərindən söhbət aç." O dedi: "Ey qardaşım oğlu, mən artıq yaşa dolmuş və qocalmışam. Ona görə Peyğəmbərdən ﷺ eşitdiyim bəzi şeyləri də unutmuşam. Odur ki, sizə nəyi danışsam onu qəbul edin, danışmadığım məsələlərə isə məni mükəlləf etməyin. Bir gün Rəsulullah ﷺ Məkkə ilə Mədinə arasında Xum adlanan yerdə bizə xütbə verdi. O Allaha həmd sənalar etdikdən sonra bizə moizələr verib *bəzi şeylər* xatırladı, sonra da belə buyurdu: "Diqqət edin ey insanlar! Şəkk yoxdur ki, mən də bir insanam. Ola bilsin ki, Allah öz elçisini (mənim canımı almaqdan ötrü) göndərsin və mən də ona tabe olum. Sizə iki şeyi qoyub gedirəm. Onlardan birincisi Allahın kitabıdır, onda hidayət və nur vardır. Ona əməl edərək ondan möhkəmcə yapışın." Beləcə

---

[1] əl-Əhzab surəsi, 30-34

[2] əl-Əhzab surəsi, 33

o, insanları Allahın kitabına təşviq etdikdən sonra buyurdu: “Allah xatirinə əhli-beytimi də sizə tapşırıram, Allah xatirinə əhli-beytimi də sizə tapşırıram, Allah xatirinə əhli-beytimi də sizə tapşırıram.” Hədisin ravilərindən biri Husayn soruşdu: “Ey Zeyd! Peyğəmbərin ﷺ əhli-beyti kimlərdir? Məgər onun xanımları əhli-beytdən deyillərmi?” O dedi: “Bəli, Peyğəmbərin ﷺ xanımları da əhli-beytdəndirlər. Lakin ümumən əhli-beyt deyildikdə Peyğəmbərdən ﷺ sonra özlərinə sədəqə qəbul etmək haram buyurulmuş kəslər nəzərdə tutulur.” O, yenə soruşdu: “Onlar kimlərdir?” O, dedi: “Əlinin ailəsi, Əqilin ailəsi, Cəfərin ailəsi və Abbasın ailəsi…” O soruşdu: “Bunların hamısına sədəqə almaq haramdırmı?” O dedi: “Bəli.”[1]

Buxarinin “Səhih” əsərində Əbu Humeyd əs-Saididən رضي الله عنه belə rəvayət olunur: “Bir gün Peyğəmbərdən ﷺ soruşdular: “Ey Allahın rəsulu, sənə necə salavat deyək?” Peyğəmbər ﷺ buyurdu: “Deyin ki: “Allahım, İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə, onu xanımlarına və zürriyyətinə də xeyir-dua ver. Allahım, İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə, onun xanımlarına və zürriyyətinə də bərəkət ver. Həqiqətən, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən!”[2]

Uca Allah İslamın əsas rüknü olan namazda Peyğəmbərin ﷺ əhli-beytənə salavat deməyi buyurmuşdur. Möminlərin əmiri Ömər ibn əl-Xəttabdan رضي الله عنه rəvayət olunur ki, Peyğəmbər ﷺ buyurmuşdur: “Qiyamət günü mənim səbəbimdən və nəsəbimdən başqa bütün səbəblər və nəsəblər qırılacaqdır.”[3]

---

[1] Muslim, “Səhabələrin fəzilətləri” kitabı, “Əlinin fəzilətləri” fəsli № 2408

[2] Buxarinin “Səhih” əsəri, “Dualar” kitabı, “Peyğəmbərdən qeyrisinə salavat gətirmək olarmı?” fəsli № 3660

[3] Bu hədisi Təbərani “əl-Mocəm əl-Əvsat” əsərində (№ 5606) Ömərdən رضي الله عنه rəvayət etmişdir. Şeyx Albani “Silsilətu əl-Əhadis əs-Səhihə” əsərində, 5/58, (№ 2036) demişdir: “Bu hədis Abdullah ibn Abbasdan, Ömər ibn əl-Xəttabdan, Misvar ibn Məxrəmədən və Abdullah ibn Ömərdən رضي الله عنهم rəvayət olunmuşdur.”

## Əhli-beyt və səhabələr barəsində müsəlmanların etiqadı

Şübhəsiz ki, Haşimilərin nəsil şəcərəsi ən şərəfli nəsil hesab olunur. Müsəlmanların Haşimi övladlarına bəslədikləri sevgi Peyğəmbərə ﷺ olan sevgilərindən əmələ gəlir. Müsəlman olduqlarına, üstünlüklərinə, İslamı ilk əvvəl qəbul etdiklərinə, Peyğəmbərlə ﷺ qohum olduqlarına və Peyğəmbərin ﷺ əhli-beyt xüsusundakı vəsiyyətinə görə əhli-beyti sevmək vacib əməllərdən sayılır və hər bir müsəlman bu məhəbbtə görə savab qazanır.

Əhli-beyti sevmək xüsusunda insanlar iki qrupa bölünürlər: ifrata varanlar, təfritdə olanlar. Bunların hər ikisi həddi aşmaq hesab olunur. Düzgün rəy isə onları sevməyin vacibliyini deməkdir. Əslində onları sevmək elə Peyğəmbəri ﷺ sevmək deməkdir. Lakin həm haqqını verməmək, həm də ifrata varmaq həddi aşmaq sayılır. Peyğəmbərin ﷺ həm dünyada, həm də axirətdə zövcələri sayılan xanımları da əhli-beytdən sayılırlar. Əhli-beytin nə qədər böyük fəzilətləri və üstünləri olsa da öz aralarında onların bəziləri fəzilət baxımından digərlərini üstələmişdir. Çünki Allahın Rəsulundan savayı heç kəs ﷺ məsum (günahsız) deyildir.

**Əhli-beytdən hesab olunmağın əsas şərtləri:**

- Onlar İslam dinində olmalıdırlar. Həmin nəsildən kafir olanları sevib dost tutmaq olmaz. Çünki yalnız qohumluq kifayət etmiş olsaydı Əbu Ləhəbə kifayət edərdi!!

- Onlar Peyğəmbərin ﷺ yoluna tabe olmalıdırlar. Muslimin "Səhih" əsərində belə deyilir: "Agah olun ki, əbu filankəsin[1] ailəsi mənim dostlarım deyillər. Mənim dostum ancaq Allah və əməlisaleh möminlərdir."[2]

Mötəbər İslam alimləri də əqidə kitablarında bunun vacibliyini vurğulamışlar. Həmin alimlərdən bəziləri aşağıdakılardır:

---

[1] Burada qeyri-müsəlmanlar nəzərdə tutulur. Kafir yaxın adam olsa belə, onu dost tutmaq olmaz

[2] Muslimin "Səhih" əsəri, "İman" kitabı, "Möminlərin bir-biriləri ilə dost olmaları" fəsli № 215

* İmam ət-Təhavi öz məşhur əqidə kitabında (vəfatı: hicri 321)
* İmam əl- Bərbəhari (vəfatı: hicri 329)
* Əl-Acurri "əş-Şəriə" əsərində (vəfatı: hicri 360)
* Əl-İsfraini (vəfatı: hicri 471)
* Əl-Qəhtani "ən-Nuniyyə" əsəri (vəfatı: hicri 378)
* İbn Qudəmə əl-Məqdisinin "Lumətul etiqad" əsəri (vəfatı: hicri 620)
* Şeyxul İslam İbn Teymiyyənin "əl-Vasitiyyə" əsəri (vəfatı: hicri 728)
* İbn Kəsir əd-Diməşqinin təfsir əsəri (vəfatı: hicri 774)
* Muhəmməd ibn İbrahim əl-Vazir əl-Yəməni "İsar əl-Haqq aləl-xalq" əsəri (vəfatı: hicri 840)
* Siddiq Həsən Xanın "əd-Dinul-xalis" əsəri (vəfatı: hicri 1307)
* Abdurrəhman ibn Nasir əs-Sədi "ət-Tənbihət əl-Latifə" əsəri (vəfatı: hicri 1376). Və başqa bu kimi əsərlər.[1]

## Səhabələr kimlərdir?

Hafiz İbn Həcər demişdir: "Səhabə barəsində rast gəldiyim ən doğru tərif belədir: Peyğəmbərlə ﷺ görüşüb, ona iman gətirən və müsəlman olaraq ölən kəsə səhabə deyilir."[2]

Bununla da əhli-beytdən Peyğəmbəri ﷺ görüb İslamı qəbul edənlər də səhabə sayılırlar. Ona görə də əksər kitablarda əhli-beytlə səhabələrin tərcümeyi halları, onlar arasında fərq qoymadan birlikdə qeyd olunur. Daha doğrusunu isə Allah bilir.

**Səhabələrin fəzilətlərinə dair dəlillər çoxdur. Onlardan bəziləri bunlardır:**

Uca Allah buyurur: **"Siz insanlar üçün üzə çıxarılmış ən xeyirli ümmətsiniz."[3]** Adi insanlardan fərqli olaraq bu ayə səhabələrə aid deyilsə, onda bəs kimə aid olacaq?"

[1] "İsticlabu İrtiqa əl-Ğuraf Bitəsarruf" səh. 165-178
[2] "əl-İsabə" əsəri, səh. 8
[3] Ali İmran surəsi, 110

Uca Allah buyurur: **"Beləliklə Biz sizi orta bir ümmət etdik."**[1] Orta ümmət deyildikdə ən xeyirlilər nəzərdə tutulur. Bu ümmətdən də ayənin hökmünə girməyə daha layiq olan məhz səhabələrdir. Əhli-beyt də elə səhabələrin daxilindədir.

Uca Allah buyurur: **"Möminlər *Hüdeybiyyədə* ağac altında sənə beyət edərkən Allah onlardan razı qaldı. *Allah* onların qəlbində olanı bildi, onlara *mənəvi* rahatlıq nazil etdi və onları yaxın bir zəfərlə mükafatlandırdı."**[2]

Allah kimdən razı qalarsa həmin adam bu razılığın tələblərinə də layiqdir. Belə ki, Allahın heç vaxt həmin adama qəzəbi tutmayacaq. Çünki, Allah qeybi bilir və heç vaxt vədinə xilaf çıxmır.

Uca Allah buyurur: **"Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar."**[3]

Uca Allah buyurur: **"Ey Peyğəmbər! Sənə və sənin ardınca gedən möminlərə Allah kifayət edər."**[4]

Uca Allah buyurur: **"*Qənimət həmçinin* yurdlarından qovulmuş və mallarından məhrum olunmuş yoxsul mühacirlərə məxsusdur. Onlar Allahın mərhəmətini və razılığını qazanmağa can atır, Allaha və Onun Rəsuluna kömək edirlər. Doğru olanlar da məhz onlardır."**[5]

Uca Allah bu ayədə onların sadiq olduqlarını, yəni münafiq olmadıqlarını bildirmişdir. Əgər səhabələrin yalnız hicrətləri, Allah yolunda vuruşmaları, canlarını və mallarını Allah yolunda xərcləmələri, müsəlman olmayan valideyin və övladlarına qarşı vuruşmaları, dində bir-birilərinə nəsihət etmələri, güclü iman və inam sahibi olmaları olsaydı bu üstünlüklər onlara kifayət edərdi.

---

[1] əl-Bəqərə surəsi, 143
[2] əl-Fəth surəsi, 18
[3] ət-Tovbə surəsi, 100
[4] əl-Ənfal surəsi, 64
[5] əl-Həşr surəsi, 8

# Pak sünnədə səhabələrin fəzilətləri ilə bağlı varid olmuş dəlillər

Abdullah ibn Muğaffəldən ﷺ rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: "Səhabələrim xüsusunda Allahdan çəkinin! Səhabələrim xüsusunda Allahdan çəkinin! Məndən sonra onlara qarşı olmayın. Onları sevən şəxs məni sevdiyinə görə onları sevmiş olar, onlara nifrət edən şəxs də mənə nifrət etdiyinə görə onlara nifrət etmiş olar. Onlara əziyyət verən, mənə əziyyət verər, mənə əziyyət verən də Allaha əziyyət vermiş olar. Allaha əziyyət verəni isə O, məhv edər."[1]

Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Səhabələrimi söyməyin, səhabələrimi söyməyin. Canım Əlində olan Allaha and olsun ki, sizlərdən biriniz Uhud dağı boyda qızıl sədəqə vermis olsa, onlardan birinin verdiyi bir ovuc, hətta yarım ovuc sədəqəyə belə çata bilməz."[2]

Peyğəmbərdən ﷺ yekdil olaraq rəvayət olunmuşdur ki, "Ən xeyirli insanlar mənim dövrümdə yaşayan insanlardır; sonra onların ardınca gələnlərdir..."[3]

Bəhz ibn Həkim atasından, o da öz atasından rəvayət etmişdir ki, Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Diqqət edin, sizlər yetmiş ümmətin sonuncususunuz və siz Allah yanında onların ən xeyirliləri və ən hörmətlilərisiniz."[4]

---

[1] Tirmizinin "Sünən" əsəri, "Peyğəmbərin ﷺ səhabələrini söyən şəxs barəsində varid olanlar" fəsli, № 3862; Tirmizi demişdir: "Bu qərib hədisdir." Bəzi nüsxələrdə isə Tirmizi demişdir: "Bu həsən-qərib hədisdir." Qərib hədis deyildikdə, digər rəvayətlərdən fərqlənən tək bir ravinin rəvayət etdiyi hədis nəzərdə tutulur

[2] Muslimin "Səhih" əsəri, "Səhabələrin fəzilətləri" kitabı, "Səhabələri söyməyin haram olması" fəsli № 2540

[3] Buxarinin "Səhih" əsəri, "Peyğəmbərin ﷺ səhabələrinin fəzilətləri" kitabı, "Peyğəmbərin ﷺ səhabələrinin fəzilətləri" fəsli № 3650; Muslimin "Səhih" əsəri, "Səhabələrin fəzilətləri" kitabı № 2533

[4] İmam Əhmədin "Musnəd" əsəri, № 20041; Şüeyb əl-Arnaut hədisin isnadının həsən olduğunu bildirmişdir

## Peyğəmbərlərin ən xeyirlisi Muhəmmədin ﷺ səhabələri barədə müsəlmanların etiqadı

Əvvəldə zikr etdiyimiz Quran və hədislərdəki dəlillərə, habelə zikr etmədiyimiz digər dəlillərə əsasən qəti olaraq deyə bilərik ki, müsəlmanların Peyğəmbərlərin ən xeyirlisi Muhəmmədin ﷺ səhabələri barəsindəki etiqadı odur ki, onlar peyğəmbərlərdən sonra məxluqatın ən xeyirliləridirlər.

Müsəlmanlar Rəsulullahdan ﷺ sonra həm səhabələr tərəfindən, həm də Peyğəmbərin ﷺ özünün təşəbbüsü ilə xəlifə seçilmiş Əbu Bəkrin رضي الله عنه xilafətini, onun da özündən sonra xəlifə təyin etdiyi Ömərin رضي الله عنه xilafətini, habelə Ömərin əmrinə görə həm Şura əhlinin, həm də digər müsəlmanların seçiminə əsasən xəlifə seçilmiş Osmanın رضي الله عنه xilafətini, ondan da sonra həm Ammar ibn Yasir, Səhl ibn Huneyf kimi Bədr döyüşündə iştirak etmiş səhabələrin, həm də onlardan qeyrilərinin beyəti ilə xəlifə seçilmiş Əli ibn Əbu Talibin رضي الله عنه xilafətini təsdiq edirlər. Onlar səhabələrin رضي الله عنهم fəzilətləri ilə bağlı bu ayələri deyirlər. Uca Allah buyurur: **"Möminlər *Hüdeybiyyədə* ağac altında sənə beyət edərkən Allah onlardan razı qaldı."**[1] Uca Allah buyurur: **"Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar."**[2] Odur ki, Allah kimlərdən razı qaldığını təsdiq edərsə həmin şəxs Onun qəzəbinə səbəb ola biləcək əməllərdən uzaq olur. Yaxşı əməllər etdikləri təqdirdə onlara tabe olanlar da Allahın qəzəbindən uzaq olmuş olurlar. Onlara tabe olanlardan kimsə yaxşı işlər görməkdən uzaq olarlarsa bu vəsf onlara şamil olunmur.[3]

Həsən əl-Bəsridən səhabələrin arasında baş vermiş çəkişmə barəsində soruşduqda o çox gözəl bir cavab vermişdir. O belə demiş-

---

[1] əl-Fəth surəsi, 18

[2] ət-Tovbə surəsi, 100

[3] Əbu Bəkr əl-İsmailinin "Etiqadu Əimmətil-hədis" əsəri 1/17; İbn Qudəmə əl-Məqdisinin "Lumətul-etiqad" əsəri 1/171; İbn Əbu əl-İzzin "Şərhu əl-Əqiydətu ət-Təhaviyyə" əsəri, 1/485

dir: “Muhəmmədin ﷺ səhabələrinin arasında baş vermiş döyüşlərdə biz iştirak etməmişik, onların agah olduqlarından biz bixəbərik, onların bir olduqları məsələlərdə onlara tabe olmalı, ixtilaf etdikləri məsələlərdə isə susmalıyıq.”

Sələflər, səhabələr arasında baş vermiş fitnə barəsində danışmağı tərk etməyi tövsiyə edərək belə demişlər: “Allah bizim əllərimizi onların qanlarına batmaqdan qorumuşdur. Elə isə gəlin dillərimizi onların qanlarına batırmayaq.”[1]

Aşağıdakı ayə bizim üçün örnək olmalıdır:

**“Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən, Sən olduqca şəfqətlisən, rəhmlisən!”[2]**

## Həm səhabə həm də əhli-beytdən sayılan bəzi şəxsiyyətlərin adları

Onlardan Abdulmuttalibin iki oğlu Abbası və Həmzəni, Əbu Talibin iki oğlu Cəfəri və Əlini, Əlinin iki oğlu Həsəni və Hüseyni, Cəfərin iki oğlu Abdullahı və Muhəmmədi, sonra Haris ibn Abdulmuttalibin oğulları Əbu Sufyanı, Nofəli, Rabiəni və Ubeydəni, habelə Abbas ibn Abdulmuttalibin bəzi oğullarını və Əqil ibn Əbu Talibi misal göstərmək olar. Allah onların hamısından razı olsun!

Qadınlardan isə Peyğəmbərin ﷺ qızları Fatimə, Ruqayyə, Ummu Gülsüm və Zeynəbi, qız nəvələrindən Əli ibn Əbu Talibin qızları Ummu Gülsümlə Zeynəbi, həyat yoldaşlarından Xədicə, Sevda, Aişə, Həfsa, Zeynəb bint Xuzeymə, Ummu Sələmə Hind Bint Əbu Umeyyə, Zeynəb bint Cəhş, Cüveyriyyə əl-Mustaliqiyyə, Ummu Həbibə Ramlə bint Əbu Sufyanı, sonra bibilərindən Safiyyə, Ərva və Atikəni, əmisi qızlarından isə Ummu Hani bint Əbu Talibi və Durra bint Əbi Ləhəbi, habelə *əhli-beytdən olan* digər səhabə qadınları misal çəkmək olar. Allah onların da hamısından razı olsun![3]

---

[1] “Aun əl-Məbud” əsəri, 12/274

[2] əl-Həşr surəsi, 10

[3] Kim bu mövzuda daha geniş məlumat almaq istəyirsə aşağıdakı mənbələrə nəzər sala bilər:

# İkinci Fəsil
# Əhli-beytin Peyğəmbərin ﷺ səhabələri barəsində dedikləri təriflər

Uca Allah Öz qullarının qəlblərinə nəzər salaraq Muhəmmədin ﷺ qəlbinin ən təmiz qəlb olduğunu görmüşdür. Beləcə onu seçib insanlara elçi olaraq göndərmişdir. Muhəmmədin ﷺ qəlbindən sonra yenə insanların qəlblərinə nəzər salmış və Peyğəmbərin ﷺ səhabələrinin qəlblərinin ən təmiz qəlblər olduğunu görmüş və beləcə onları elçisinin gətirdiyi din uğrunda mübarizə aparan vəzirlər təyin etmişdir.[1]

İzzət və Cəlalət sahibi olan Rəbbimiz yeddi qat səmanın üzərindən onları tərifləyərək buyurmuşdur: **"Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar.** ***Allah*** **onlar üçün altından çaylar axan, içində əbədi qalacaqları cənnətlər hazırlamışdır. Bu, böyük uğurdur."[2]**

Bu ayədə açıq-aydın bildirilir ki, Allah mühacir və ənsarlardan, habelə onlara gözəl bir şəkildə tabe olanlardan razıdır. Habelə Allah onları böyük bir uğurla və əbədi qalacaqları Nəim cənnətləri ilə müjdələyir.

Allahın razılığından sonra hansı dil onları lənətləyə bilər və ya *hansı dil* onlar barəsində nalayiq sözlər söyləyə bilər?! Habelə hansı şəxs onları alçalda bilər və ya onlar barəsində tənə dolu zəhərli kitablar yaza bilər?! Axı vədinə əsla xilaf çıxmayan Uca Allah on-

---

a) Salim əl-Abd əl-Cadirin "Məali ər-Rutəb limən cəməa bəynə şərafey əs-Suhbəti vən-nəsəb" əsəri

b) Əbu Muaz əl-İsmailinin "əl-Əsmau vəl-musahərat" əsəri

[1] Bu İbn Məsuddan nəql olunmuş əsərdir. Bəziləri bu rəvayətin isnadının Peyğəmbərə ﷺ qədər çatdığını söyləmişdir. İmam Əhmədin "Musnəd" əsəri, (3600). Bu rəvayəti əl-Acluni "Kəşf əl-Xafə" əsərində "məuquf" isnadla nəql etmiş və onun həsən olduğunu bildirmişdir. Həmçinin şeyx Albani də "Şərhu əl-Aqiydətu ət-Təhaviyyə" əsərində bu rəvayətin həsən olduğunu söyləmişdir

[2] ət-Tovbə surəsi, 100

ları altından çaylar axan Cənnətlə müjdələmiş, onların orada əbədi qalacaqlarını və qurtuluşa çatacaqlarını bildirmişdir.

Yaxşı deyiblər: "Yaxşı insanların qədrini yalnız yaxşılar bilər." Bu səbəbdən də səhabələrin qədrini və onların həm Uca Allah, həm də Onun Peyğəmbəri ﷺ yanındakı hansı yüksək məqama sahib olduqlarını hamıqan əvvəl Peyğəmbərin ﷺ əhli-beyti bilirdi.

## İmam Əli ibn Əbu Talibin رضي الله عنه və onun tərəfdarlarının səhabələrə verdikləri təriflər

Bir dəfə səhabələrin halını yaxşıca bilən Əli ibn Əbu Talib رضي الله عنه onları vəsf edərək belə demişdir: "Mən Peyğəmbərin ﷺ səhabələrini görmüşəm, sizin aranızda onlara bənzəyən birisi yoxdur. Onlar növbələşərək gecələri səcdədə və qiyamda keçirər, saçları dağınıq və toz torpaq halında da səhərə çıxardılar. Onlar qayıdacaqları yeri xatırladıqda sanki yanar köz üstə durmuş kimi görünərdilər. Gecələri o qədər səcdə içində keçirərdilər ki, yuxuları qeybə çəkilərdi. Allah xatırlandığı zaman o qədər ağlayardılar ki, göz yaşlarından yaxaları islanar və güclü fırtına zamanı ağacın tir-tir əsdiyi kimi onlar da əzabdan qorxaraq və savab qazanmağa ümid edərək tir-tir əsərdilər."[1]

Həmçinin Əli ibn Əbu Talibdən رضي الله عنه Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Həm məni görənin, həm məni görənləri görənlərin, həm də məni görən səhabələri görənlərin xoş halına."[2] Əgər Peyğəmbəri ﷺ görməklə, hətta Peyğəmbəri ﷺ görən səhabələri və səhabələri görən tabiinləri görməklə bu cür böyük fəzilətə nail olmaq mümkündürsə onda biz nəyin əsasında Allahın və Onun Rəsulunun ﷺ təmizə çıxartdırı o camaat barəsində artıq-əksik danışmağa cürət edə bilərik?

Başqa bir yerdə Əli رضي الله عنه həm özünün, həm də Peyğəmbərin ﷺ səhabələrinin hamısının düşmən qarşısında necə cəsur dayandığı-

---

[1] "Nəhc əl-Bəlağə" əsəri, səh. 143; Bunlar Əlinin رضي الله عنه həm Bənu Umeyyənin vəsfi, həm də onun dövründəki insanların halı barəsindəki sözləridir

[2] əl-Məclisinin "Bihar əl-Ənvar" əsəri, 22/313; "Amali ibn əş-Şeyx" əsəri səh. 281-282

nı vəsf edərək belə demişdir: "Biz o zaman Peyğəmbərlə ﷺ birlikdə vuruşar və döyüşlərdə *bizə düşmən olan* atalarımızı, övladlarımızı, əmilərimizi və qardaşlarımızı qətlə yetirərdik. Bütün bunlara rəğmən bu bizim imanımızı və doğru yol üzərində sabit qalmağımızı artırır, ağrılara qarşı səbrimizi gücləndirirdi və biz düşmənlərimizə qarşı daha sərt mübarizə aparırdıq. Bizlərdən biri düşmənlə qarşı-qarşıya gəldikdə bir-birinin üstünə cuman öküzlər kimi bir-birimizi öldürmək məqsədi ilə hər iki tərəf bir-birinə hücum edərdi ki, görək hansı biri digərinə ölüm qədəhi içirdəcək. Bəzən biz qələbə çalırdıq, bəzən də düşmənlərimiz. Uca Allah düşmənlərə qarşı apardığımız mübarizədə sadiq olduğumuzu gördükdə düşmənlərimizə məğlubiyyət, bizə isə qələbə bəxş edirdi. Bununla da İslam dini yer üzündə bərqərar oldu. Allaha and olsun ki, bizim halımız sizinki kimi olsaydı bu din ayağa qalxmaz və iman ağacı yaşıllaşmazdı. Bütün bunlara rəğmən Allaha and olsun ki, siz qan tökərək peşmançılıq çəkəcəksiniz."[1]

Bir dəfə Ömər ibn əl-Xəttab رضي الله عنه gəlib onunla Rum İmperatorluğuna qarşı vuruşmağı məsləhətləşəndə Əli رضي الله عنه demişdi: "Əgər sən bu düşmənə qarşı vuruşmağa özün getsən çətin bir vəziyyətə düşərsən. Çalış özünü müsəlmanlara əvəzolunmaz sığınacaq etmə. Bir nəfər igidi ora rəhbər təyin et və mahir döyüşçüləri buna təşviq et. Əgər Allah bu işə xeyir bəxş etsə hər şey sənin istədiyin kimi olar. Yox əgər vəziyyət başqa cür olsa sən yenə insanların müraciət edə biləcəkləri şəxs olacaqsan."[2]

Həmçinin Əli رضي الله عنه Ömərə رضي الله عنه nəsihət edərək demişdir: "Özün dəyirmanın oxu ol, dəyirmanı isə ərəblərlə fırlat. Sən olmasan onların arasında müharibə olar. Əgər bu dünyadan gedəsi olsan ərəblər hər tərəfdən sənə qarşı gələr. Sənin arxanda buraxıb getdiyin nöqsanlar sənin üçün önündəkilərdən daha önəmli olar. Vaxt gələr əcnəbilər sənə baxanda belə deyərlər: "Baxın, bu ərəblərin rəhbəridir. Əgər onu məhv edə bilsəniz rahatlıq taparsız. Bu onların sənə qarşı olan hiddətləri və sənin barəndə ən böyük istəkləri olar."[3]

---

[1] "Nəhc əl-Bəlağə" əsəri, səh. 105; Əlinin رضي الله عنه Peyğəmbərin ﷺ zamanında etdikləri döyüşlərin vəsfi barəsində söylədikləri kəlamlardan

[2] "Nəhc əl-Bəlağə" əsəri, 134-cü xütbə

[3] "Nəhc əl-Bəlağə" əsəri, səh. 203, 146-cı xütbə

Həmçinin Ömər ibn əl-Xattabın ﵁ vəfatından sonra Əli ﵁ onu tərifləyərək deyərdi: "Allah xatirinə, bir görün filankəs nə qədər xeyir işlər görüb, bir sıra səhvləri düzəldib, yaralara məlhəm qoyub, Sünnəni müdafiə edib, fitnəni isə tərk edib! O, bu dünyanı alnıaçıq və eyibləri az olaraq tərk etdi, yaxşı işlər görüb, pis işlərdən çəkindi. O, Allaha tam bir itaətlə boyun əyərək Ondan layiqincə qorxurdu. O, özündən sonrakılara elə bir açıq-aydın yol qoydu ki, çaşqınlıqda olanlar hidayətə vara bilsin, hidayət əhli isə yolunu azmasın."[1]

İbn Əbu əl-Hədid[2] Nəhc əl-Bəlağə əsərinin şərhində Əli ibn Əbu Talibin Ömər barəsindəki yuxarıdakı sözünü izah edərkən demişdir: "*Əli demişdir:* "Allah xatirinə, bir görün filankəs filankəs nə qədər xeyir işlər görüb..." Burada "filankəs" dedikdə İmam Əli, Ömər ibn əl-Xəttabdan bəhs edir. Nəhc əl-Bəlağə əsərini toplayan Ər-Radiy Əbu əl-Həsənin[3] nüsxəsində "filankəs" sözünün altında Ömər sözü yazılmışdır. Bunu mənə şair Fəxxar bin Mə'd əl-Musəvi əl-Ovdi demişdir."[4]

Əli ibn Əbu Talib ﵁ başqa bir məqamda da Öməri ﵁ tərifləyərək demişdir: "Onun dostları bizim də dostumuzdur. Çünki o, dinin ucalması naminə əlindən gələni əsirgəməmişdir."[5]

---

[1] "Nəhc əl-Bəlağə" əsəri, səh. 222, Əlinin ﵁ Ömər ibn əl-Xəttabı ﵁ barəsində söylədikləri tariflərdən

[2] İbn Əbu əl-Hədid: İzzuddin Abdulhəmid ibn Muhəmməd ibn əl-Hüseyn ibn Əbu əl-Hədid əl-Mədaini yazıçı və şairdir. O "Nəhc əl-Bəlağə" əsərinə ən böyük şərh yazmışdır. "əl-Qəsaidus-səbi əl-Ələviyyat" əsəri də onundur. Hicrətin 586-cı ilində dünyaya gəlmiş, 655-ci ilində də Bağdad şəhərində vəfat etmişdir. Abbas əl-Qummi "əl-Kunə vəl-əlqab" əsərində (1/192) onun tərcümeyihalını yazmış və onu tərifləmişdir

[3] ər-Radiy Əbu əl-Həsən: Muhəmməd ibn əl-Hüseyn ibn Musa ibn İbrahim ibn Musa əl-Kazım alim və yazıçıdır. Hicrətin 359-cu ilində dünyaya gəlmiş və 456-cı ilində isə vəfat etmişdir. Abbas əl-Qummi "əl-Kunə vəl-əlqab" əsərində (2/272) onun tərcümeyihalını yazmış və onu tərifləmişdir. Habelə, "Nəhc əl-Bəlağə" əsərini ər-Radiy Əbu əl-Həsən cəm etdiyini isbat etmiş və bunun əksini iddia edənlərə isə rəddiyyələr yazmışdır

[4] İbn Əbu əl-Hədidin "Şərhu Nəhc əl-Bəlağə" əsəri, 12/3

[5] "Nəhc əl-Bəlağə" əsəri, 4/108.

İbn Əbu əl-Hədid demişdir: "Burada "onun dostları" deyildikdə Ömər ibn əl-Xəttab nəzərdə tutulur və Ömərin din üçün canını fəda etdiyindən söhbət gedir."[1]

İmam Əhməd Muhəmməd ibn Hatibdən rəvayət etmişdir ki, mən Əlinin رضي الله عنه belə dediyini eşitmişəm: **"Əzəldən ən gözəl aqibət yazılmış insanlara gəldikdə isə, onlar Oddan uzaqlaşdırılmış olacaqlar."**[2]- ayəsi Osmana رضي الله عنه da şamil olunur."[3]

Başqa bir rəvayətdə isə Muhəmməd ibn əl-Hənəfiyyə demişdir: "Aişənin Osmanın qatillərini lənətləməsi xəbəri gəlib Əliyə رضي الله عنه çatdıqda o, əllərini yuxarı qaldıraraq 2-3 dəfə: "Mən də Osmanın qatillərini harada olurlarsa olsunlar lənətləyirəm" – dedi."[4]

Əli رضي الله عنه ilə Ömər رضي الله عنه arasındakı xoş münasibətlərin ən bariz nümunəsi Əlinin öz qızı Ummu Gülsümü Ömərə ərə verməsidir. Bütün tarix, siyra, hədis və fiqh kitabları bunu sübut edir.[5]

Tarix kitablarında İmam Əlinin yaxın tərəfdarlarından biri kimi göstərilən Malik əl-Əştər ən-Nəxaiyə[6] bax, o, Əbu Bəkrlə رضي الله عنه Öməri رضي الله عنه təri̇fləyərək demişdir: "Şübhəsiz ki, Uca Allah bu ümmətə Muhəmmədi صلى الله عليه وسلم göndərməklə onlara böyük bir nemət bəxş

---

[1] İbn Əbu əl-Hədidin "Şərhu Nəhc əl-Bəlağə" əsəri, 20/2180

[2] əl-Ənbiya surəsi, 101

[3] "Fədail əs-Səhabə" əsəri, № 771. Kitabı təhqiq edən alim rəvayətin isnadının səhih olduğunu qeyd etmişdir

[4] "Fədail əs-Səhabə" əsəri, № 732. Kitabı təhqiq edən alim rəvayətin isnadının səhih olduğunu qeyd etmişdir

[5] Bu evlilik Ömərin Fatiməni vuraraq onun bətnindəki körpəsinin ölümünə səbəb olması kimi uydurma rəvayətlərin batil və əsassız olduğunu sübut edir. Elə fikirləş ki, bir adam sənin həyat yoldaşını vurmuş və bu da sənin övladının ölümünə səbəb olmuşdur. Bundan sonra sən öz qızını həmin adama ərə verərsənmi?! Həmin adamın sənin kürəkənin olmasına razı olarsanmı?! Yaxud övladlarından birinə həmin adamın adını verərsənmi?! Bu tarixi həqiqətləri bilmək istəyirsənsə aşağıda adını qeyd etdiyim kitaba müraciət edə bilərsən. Seyyid Əhməd İbrahim Əbu Muaz əl-İsmaiylinin "Ömər ibn əl-Xəttabın Əli ibn Əbu Talibin qızı Ummu Gülsüm ilə evlənməsi həqiqətdir, iftira deyil" adlı əsəri

[6] Malik əl-Əştər ən-Nəxai: Bu Malik ibn əl-Haris əl-Əştər ən-Nəxaidir. Şeyx Abbas əl-Qumminin dediyinə görə "ən-Nəxa" Yəməndə Məzhəc qəbiləsindən sayılan böyük bir qəbilədir. ən-Nəxanın adı Cisr ibn Amr ibn Ulə ibn Cələd ibn Malik ibn Əduddur. "əl-Kunə vəl-əlqab" əsəri, 3/244

etmiş, onun vasitəsi ilə dini ucaltmış və insanlar arasında yaymışdır. O, insanlar arasında müəyyən müddət yaşadıqdan sonra Allah onu Öz dərgahına qaldırmışdır. Sonra Allahın kitabına və Peyğəmbərinin ﷺ sünnəsinə tabe olan şəxslər hakimiyyətə gəlmişdilər. Allah da onlara etdikləri saleh əməllərin əvəzi olaraq ən gözəl mükafatlar bəxş etmişdir."[1]

Başqa bir xütbədə isə belə demişdir: "Ey insanlar, Uca Allah Öz elçisi Muhəmmədi ﷺ sizlərə müjdələyən və xəbərdar edən bir Peyğəmbər olaraq göndərmiş, ona halal və haramları, vacibləri və nafilələri əhatə dən bir kitab nazil etmişdir. O, öz missiyasını yerinə yetirdikdən sonra dünyasını dəyişmiş və onun yerinə Əbu Bəkr رضي الله عنه xəlifə təyin olunmuşdur. O da Peyğəmbərin ﷺ yolunu tutub getmiş, onun sünnəsinə tabe olmuşdur. Əbu Bəkrdən sonra onun yerinə Ömər gəlmiş və sələfinin yolunu davam etdirmişdir."[2]

## İmam Abdullah ibn Abbas ibn Abdulmuttalibin رضي الله عنهما verdiyi təriflər

Ümmətin alimi və Quranın tərcümanı Abdullah ibn Abbasa رضي الله عنهما nəzər salın. O, Peyğəmbərin ﷺ səhabələri barəsində belə demişdir: "Şübhəsiz ki uca təriflərə və pak adlara sahib olan Allah Peyğəmbəri Muhəmmədə ﷺ elə bir səhabələr bəxş etmişdi ki, onlar onu ﷺ öz canlarından və mallarından üstün tutardular. Onlar hər bir halda Peyğəmbər ﷺ üçün canlarını fəda edərdilər. Uca Allah onları öz kitabında belə vəsf etmişdir: **"Muhəmməd Allahın Elçisidir. Onunla birlikdə olanlar kafirlərə qarşı sərt, öz aralarında isə mərhəmətlidirlər. Sən onları rüku edən, səcdəyə qapanan, Allahdan lütf və razılıq diləyən görərsən. Əlamətləri isə üzlərində olan səcdə izidir. Bu onların Tövratdakı vəsfidir. İncildə isə onlar elə bir əkin kimi vəsf olunurlar ki, bu *əkin* cücərtisini üzə çıxarıb onu qüvvətləndirmiş, o da getdikcə qalınlaşıb gövdəsi üstündə şax duraraq əkinçiləri heyran etmişdir.** ***Allah mö-***

---

[1] İbn əl-Ə'samın "əl-Futuh" əsəri, 1/385

[2] İbn əl-Ə'samın "əl-Futuh" əsəri, 1/396

***minlərin sayını artırır, özlərini də qüvvətləndirir* ki, kafirləri qəzəbləndirsin. Allah onlardan iman gətirib yaxşı işlər görənlərə bağışlanma və böyük bir mükafat vəd etmişdir.”**[1]

Səhabələr dinin şüarlarını yüksəltmiş, müsəlmanlara çalışqan olmalarını tövsiyə etmiş və bu minvalla da Allahın neməti özünü biruzə vermiş, Onun dini güclənərək yer-üzərində bərqərar olmuş və şüarları aydınlanmışdır. Habelə, səhabələrin vasitəsilə şirkin kökü kəsilmiş, müşriklərin rəhbərləri məhv edilmiş və şirkə aparan amillər silinmişdir. Beləcə Allahın sözü hər şeydən uca olmuş, kafir olanların sözü isə alçalmışdır. O pak və təmiz şəxsiyyətlərə, onların ruhlarına Uca Allahın salavatı, rəhməti və bərəkəti olsun. Onlar həyatda ikən Allaha dost, öldükdən sonra isə diri və Allahın qulları üçün nəsihət verən olmuşlar. Onlar axirətə çatmamış oranı qazanmış, dünyadan çıxmamış onu tərk etmişdilər.”[2]

Abdullah ibn Abbasın ﵄ səhabələrə verdiyi bu vəsflərin hamısı onların fəzilətlərinə və barələrində deyilən gözəl təriflərə aiddir. Onlar həqiqətən də söylənildiyi kimi idilər. Uca Allah onları seçərək Peyğəmbərə ﷺ səhabə olmaqla şərəfləndirmişdir. Onlar da canlarını və mallarını ona fəda etmiş, İslam dininin şüarlarını uca tutmuş, ümmətə nəsihət etmiş, İslam dini yer üzərində bərqərar olanadək onun yayılmasında və əsaslarının möhkəmlənməsidə iştirak etmişdilər. Uca Allah onların vasitəsi ilə şirki və onun əhlini alçaltmış, müşriklərin başçılarını aradan götürmüş və şirkə dəstək verən amilləri məhv etmişdir. Habelə, Allah onların vasitəsi ilə Öz kəliməsini ucaltmış, batilin kəliməsini isə darmadağın etmişdir. Buna görə də onların qəlbləri saf və ruhları pak idi. Onlar bu dünyada Allahın dostlarına çevrilmişdilər. Allah onların hamısından razı olsun.

Həmçinin Abdullah ibn Abbas ﵄ Osman ibn Əffanı ﵁ tərifləyərək demişdir: “Allah Əbu Amra rəhmət eləsin! Allaha and olsun ki, o, yaxınlarımızın ən səxavətlisi və ən fəzilətlisi idi. O, gecələri oyaq qalar, cəhənnəmin adı çəkildikdə şox ağlayar, yaxşı işlər-

---

[1] əl-Fəth surəsi, 29

[2] “Muruc əz-Zəhəb va Məadin əl-Cəvahir” əsəri, 3/75

də hər kəsi qabaqlayar və savab qazanmaqda hamını keçərdi. O, insanların sevimlisi, alicənabı, vəfalısı və əl-Usra ordusunun sahibi idi. Bundan əlavə o, Peyğəmbərin ﷺ kürəkəni idi."[1]

Zeyd ibn Sabit ﵁ vəfat etdikdə İbn Abbas ﵁ belə demişdi: "Vallahi ki, onunla birlikdə böyük bir elm dəfn olundu."[2]

## İmam Əli ibn Hüseynin verdiyi təriflər

İmam Əli ibn Hüseyn (Zeynulabidin) tövhid dəvətini yaymaqda və Allahın risaləsini insanlara təbliğ etməkdə Peyğəmbərə yardım etdikləri üçün Rəsulullahın ﷺ səhabələrini xatırlayar və namazlarında dua edərək onlar üçün rəhmət və məğfirət diləyib deyərdi: "Allahım! Peyğəmbərin ﷺ səhabələrindən razı ol və onları bağışla. Onlar Peyğəmbərə gözəl yoldaş olmuş, ona yardım edərkən müxtəlif müsibətlərə düçar olmuşlar. Onlar ona yardımçı olaraq canlarını fəda etməyə tələsmiş, onun dəvətini ilk əvvəl qəbul etmişlər. Onun dəvətinə cavab vermiş, *Allahın* kəlamını uca tutmaq uğrunda həyat yoldaşlarını və övladlarını tərk etmişlər. Onlar peyğəmbərliyi təsdiq edərək öz atalarına və övladlarına qarşı mübarizə aparmışdılar. Səhabələr Peyğəmbərə ﷺ və onu sevənlərə yardım etmiş və səmərəsiz olmayacaq bir ticarətə ümid etmişdilər. O kəslər ki, Peyğəmbərə ﷺ bağlı olduqları üçün yaxınları onları tərk etmişdilər. Qohumları onlardan üz çevirmiş, onlar da Peyğəmbərlə ﷺ qohumluğu tərcih etmişdilər. Allahım! Onlar hər şeyi Sənin üçün və Sənin xatirinə tərk etmişdilər. Odur ki, Öz razılığından onlara əta et. Çünki onlar haqqı Səndən ötrü seçmişdilər. Onlar Səndən ötrü öz diyarlarını tərk edərək hicrət etmiş, rahat həyatı sıxıntı ilə əvəz etmiş və Sənin dinini izzətləndirmək üçün mal-dövlətlərini tərk edərək az bir şeylə qane olmuşlar. Odur ki, bütün bunlara görə onları mükafatlandır. Allahım! Onlardan son-

[1] "Muruc əz-Zəhəb va Məadin əl-Cəvahir" əsəri, 3/64

[2] Əhməd ibn Hənbəlin "Fədail əs-Səhabə" əsəri № 1873. Şüeyb əl-Arnaut hədisin isnadının həsən olduğunu bildirmişdir. Hədis başqa isnadlarla da rəvayət olunmuşdur

ra gələn və "Allahım bizi və bizdən öncə gəlmiş qardaşlarımızı da bağışla" – deyənləri də ən gözəl mükafatla mükafatlandır. O kəslər ki, səhabələrin yolunu tutub gedir, şəkk etmədən onların yolunu davam etdirir, həmin hidayət barəsində heç bir şübhəyə düşmürlər. Onlar eyni dinə və etiqada sahib çıxır, səhabələrlə razılaşır, onları heç bir şeydə ittiham etmirlər."[1]

Həmçinin rəvayət olunur ki, bir dəfə bəziləri Əbu Bəkr, Ömər və Osman barədə artır-əksik danışdıqda İmam Zeynulabidin onlara belə demişdi: "Siz bunlarımı nəzərdə tutursunuz? ***"Qənimət həmçinin* yurdlarından qovulmuş və mallarından məhrum olunmuş yoxsul mühacirlərə məxsusdur. Onlar Allahın mərhəmətini və razılığını qazanmağa can atır, Allaha və Onun Rəsuluna kömək edirlər. Doğru olanlar da məhz onlardır."**[2] Onlar: "Xeyr" – deyə cavab verdilər. İmam yenə soruşdu: "Bəlkə bunları nəzərdə tutursunuz? ***"Mühacirlərdən* əvvəl *Mədinədə* yurd salmış, *sonra da* iman gətirmiş kimsələr öz yanlarına hicrət edənləri sevir, onlara verdiklərinə görə qəlblərində peşmançılıq hissi duymurlar. Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar. Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır."**[3] Onlar yenə də: "Xeyr" – deyə cavab verdilər. Bu zaman imam buyurdu: "Elə isə mən şahidlik edirəm ki, siz İzzət və Cəlal Sahibi olan Allahın barələrində: ***"Səhabələrdən* sonra gələnlər deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən, Sən olduqca şəfqətlisən, rəhmlisən!"**[4] – dediyi kimsələrdən deyilsiniz. Çıxın çölə, Allah sizin bəlanızı versin!"

Əbu Hazim əl-Mədəni demişdir: "Mən Haşimilərdən Əli ibn Hüseyn kimi savadlı birisini görmədim. Bir dəfə ona belə bir sual vermişdilər: "Əbu Bəkrlə Ömər Peyğəmbərin ﷺ yanında hansı

---

[1] Zeynulabidinin "əs-Sahifətu əs-Səccadiyyə əl-Kamilə" əsəri, səh. 13
[2] əl-Həşr surəsi, 8
[3] əl-Həşr surəsi, 9
[4] əl-Həşr surəsi, 10

məqama sahib idilər?" O, əli ilə onların məzarlarına işarə edərək dedi: "Hal-hazırda burada hansı məqamdadırlarsa,[1] elə."[2]

## İmam Muhəmməd əl-Baqirin verdiyi təriflər

İbn Səd Bəssam əs-Seyrafinin belə dediyini rəvayət etmişdir: "Mən Əbu Cəfərdən Əbu Bəkr və Ömər barəsində soruşdum və o, belə buyurdu: "Allaha and olsun ki, mən onları özümü dost tutur, onlar üçün bağışlanma diləyirəm. Əhli-beytdən mənim gördüyüm hər kəs də onları özlərinə dost hesab edirdilər."[3]

Həmçinin o, demişdir: "Fatimənin övladları Əbu Bəkr və Ömər barədə yalnız gözəl söz söyləmək xüsusunda yekdil rəydədirlər."[4]

Bir dəfə Urva ibn Abdullah İmam Baqirdən qılıncı bəzəməyin caiz olub-olmaması barədə sual verdikdə o, belə demişdi: "Qılıncı bəzəməkdə bir qəbahət yoxdur, çünki Əbu Bəkr əs-Siddiq də qılıncını bəzəyərdi." Mən dedim: "Sən də ona Siddiq deyirsən?" Bu zaman o, yerindən dik atılaraq qibləyə tərəf yönəldi və dedi: "Bəli, o Siddiqdir, bəli o, Siddiqdir. Kim ona Siddiq demirsə Allah onun nə bu dünyada, nə də axirətdə heç bir sözünü təsdiqləməsin."[5]

Həmçinin onun belə dediyi rəvayət olunur: "Ovs və Xəzrəc qəbilələri İslamı qəbul edənədək nə qılınclar qınından çıxmış, nə namazda, nə də qoşunda səflər düzəlmiş, nə azan verilmiş, nə də **"Ey iman gətirənlər!"** – xitabı ilə ayələr nazil olunmuşdu."[6]

Cabir əl-Cufi demişdir: "Bir dəfə Muhəmməd bin Əli mənə dedi: "Ey Cabir, əldə etdiyim məlumata görə İraqda bir qrup insan bizi sevdiklərini deyir, üstəlik Əbu Bəkr və Ömərlə bağlı nalayiq fikirlər səsləndirərək bunu mənim əmr etdiyimi iddia edirlər. Onlara çatdır ki, mən onlardan uzağam. Muhəmmədin canı əlində olan Allaha and olsun ki, hakimiyyətə gəlmiş olsam onları qanları-

---

[1] Peyğəmbərin ﷺ, Əbu Bəkrin və Ömərin məzarları yanaşıdır
[2] "Siyər Əlam ən-Nubələ" əsəri, 4/394
[3] "ət-Təbəqat" əsəri, 5/321
[4] "Siyər Əlam ən-Nubələ" əsəri, 4/406
[5] "Siyər Əlam ən-Nubələ" əsəri, 4/408
[6] "Bihar əl-Ənvar" əsəri, 22/312

na qəltan etməklə Allaha yaxınlaşacağam. Əgər mən Əbu Bəkr və Ömər üçün bağışlanma və mərhəmət diləməsəm Muhəmmədin ﷺ şəfaəti mənə çatmaz." Sonra dedi: "Əbu Bəkrlə Ömərin fəzilətini bilməyən kəs Sünnədən bixəbərdir."[1]

## İmam Zeyd ibn Əli ibn əl-Hüseynin verdiyi təriflər

Haşim ibn əl-Bərid İmam Zeyd ibn Əlinin belə dediyini rəvayət etmişdir: "Əbu Bəkr ؓ şükür edənlərin imamı idi." Sonra o, bu ayəni oxudu: **"Allah şükür edənləri mütləq mükafatlandırar."[2]** Sonra dedi: "Əbu Bəkrdən uzaqlaşmaq Əlidən uzaqlaşmaq anlamındadır."[3]

Həmçinin o, Əbu Bəkr və Ömər haqqında belə demişdir: "Mən əhli-beytin onlar barəsində yalnız xeyir sözlər söylədiklərini eşitmişəm."[4]

Yəhya ibn Əbu Bəkr əl-Amiri "ər-Riyad əl-Mustətabə"əsərində zikr edir ki, o, İmam əl-Mənsur Billəh Abdullah ibn Həmzənin[5] "Cəvab əl-Məsail ət-Tuhəmiyyə" əsərində bir sözü ilə rastlaşmışdır. O həmin sözdə İmam Zeydin səhabələr barəsindəki fikirini belə açıqlamışdır: "İmam Zeyd səhabələrin hamısını tərifləmiş və onların digərlərindən üstün xüsusiyyətlərini sadalamış sonra da belə demişdir: "Onlar həm Peyğəmbərin ﷺ zamanında, həm də sonrakı zamanlarda insanların ən xeyirliləri sayılırlar. Allah onlardan razı olsun və onları İslamda etdikləri xidmətlərə görə xeyirlə mükafatlandırsın." Sonra dedi: "Bu bizim mövqeyimizdir, bunları söyləməyə heç kim bizi məcbur etmir, nə də ki bizlər başqa bir fikiri qəlbimizdə gizləyərək təqiyyə etmirik. Bizim məqamımıza çata bilməyən bəziləri isə onları söyür, lənətləyir, pisləyir və onlara tənə vururlar. Biz bu cür insanların əməllərindən Nöqsansız Allaha

[1] "əl-Bidayə van-Nihayə" əsəri, 9/211
[2] Ali-İmran surəsi, 144
[3] "Siyər Əlam ən-Nubələ" əsəri, 5/390
[4] Təbərinin "Tarix əl-Uməm vəl-Muluk" əsəri, 7/180
[5] O, Zeydilərin böyük alimlərindən hesab olunur

sığınırıq. Ta Əliyə ﷺ qədər ata-babalarımızın da mövqeyi belə olub." Sonra o dedi: "Bəziləri səhabələri təhqir etməklə və onlardan uzaq olduqlarını bildirməklə əhli-beytə yaxın olduqlarını düşünürlər. Halbuki bununla onlar, özləri də bilmədən Muhəmmədin ﷺ özündən uzaqlaşmış olurlar." Daha sonra o, belə bir şer parçası oxudu:

***"Əgər mən ittiham etmir, sən isə mənim əslimi təhqir edirsənsə,***
***Sanki nizə ilə böyrümə və kürəyimə vurmuş olursan"*** [1]

## İmam Abdullah ibn Həsən ibn Həsən ibn Əlinin رضي الله عنهما verdiyi təriflər

Abdullah ibn Həsən səhabələrin və raşidi xəlifələrin رضي الله عنهم hörmətini əhli-beyt kimi uca tuturdu.

Hafiz İbn Əsakir Əbu Xalid əl-Əhmərin belə dediyini rəvayət etmişdir: "Mən Abdullah ibn Həsəndən Əbu Bəkr və Ömər barədə soruşdum və o dedi: "Onların hər ikisinə Allahın salavatı olsun. Onlara salavat verməyənlərin üzərinə isə xeyir-dua nəsib olmasın.[2]"[3]

---

[1] "ər-Ruyad əl-Mustətabə" əsəri, səh. 300

[2] Uca Allah buyurur: **"Onlar üçün dua et. Çünki sənin duan onlar üçün bir təskinlikdir."** (ət-Tovbə surəsi, 103). *Ayənin ərəbcəsində hərfi tərcümədə "salavat gətir" deyilir.* Demək "salavat" dua etmək deməkdir. Buna Peyğəmbərin ﷺ bir hədisi də dəlalət edir. Hədisdə Peyğəmbər ﷺ belə buyurur: "[Allahummə salli alə ali Əbi Əufə] Allahım! Əbu Əufənin ailəsinə xeyir-dua ver!" Buxarinin "Səhih" əsəri, "Zəkat" kitabı, "İmamın zəkat verən adam üçün xeyir-duası" fəsli (63); Cabir ibn Abdullah رضي الله عنه rəvayət edir ki, bir dəfə bir qadın Peyğəmbərə ﷺ "Mənim həyat yoldaşım üçün xeyir-dua ver!" – deyə müraciət etdi. Onda Peyğəmbər ﷺ belə dua etdi: "[Səlləllahu aleyki və zəucik] Allah sənə və sənin həyat yoldaşına xeyir-dua versin!" Hədisi Əbu Davud "Sənən" əsərində, "Quran səcdələri" kitabı, "Peyğəmbərdən ﷺ qeyrisinə salavat gətirmək" fəslində səhih isnadla rəvayət etmişdir.

Bütün bu dəlillərdən bəlli olur ki, salavatın mənası dua deməkdir. İmam Abdullah ibn Həsən رحمه الله də məhz bu mənanı qəsd edirdi.

[3] "Tarix Diməşq" əsəri, 29/255-256

Həmçinin o, demişdir: "O iki nəfər yadıma düşdükdə, onlar üçün Allaha dua edirəm və bununla da mən İzzət və Cəlal Sahibi olan Allaha yaxınlaşmış oluram."[1]

Həmçinin rəvayət edilir ki, Abdullah ibn Həsənin azad etdiyi köləsi Hafs ibn Ömər demişdir: "Bir dəfə mən gördüm ki, Abdullah ibn Həsən dəstəmaz aldı və xuflarının üzərinə məsh çəkdi. Belə olduqda mən ondan soruşdum. Sən də xuflara məsh çəkirsən?" O dedi: "Bəli, çünki Ömər ibn əl-Xəttab da məsh çəkərdi. Hər kim Öməri Allahla özü arasında şəriəti doğru şəkildə nəql edən şəxs kimi götürərsə doğru yolda olduğu təsdiqlənər."[2]

Həmçinin "Tarix Diməş" əsərində deyilir: "Bir dəfə Hafs ibn Qeys Abdullah ibn Həsəndən xuflara məsh çəkmək barədə soruşduqda o dedi: "Məsh çəkə bilərsən. Ömər ibn Xəttab da məsh çəkərdi." O yenə soruşdu: "Mən sənin özün barəndə soruşuram. Sən məsh çəkirsənmi?" O dedi: "Mənim Ömərin məsh çəkdiyini deməyim sənə bəs etmirmi ki, sən mənim rəyimi soruşursam. Ömər məndən və mənim kimi yer üzündəki insanlardan daha xeyirli idi." Mən dedim: "Ey Əbu Muhəmməd, bəzi insanlar deyirlər ki, siz təqiyyə edərək belə deyirsiniz." Biz məzarla minbərin arasında ikən o mənə belə cavab verdi: "Allahım, bu mənim həm gizlində, həm də aşkarda olan sözlərimdir. Odur ki, bundan sonra heç kimin sözünü mənə eşitdirmə." Sonra o dedi: "Bu adam iddia edir ki, guya Əli ﷺ inciklidir. Peyğəmbər ﷺ Əliyə müəyyən göstərişlər vermiş, o isə həmin göstərişləri həyata keçirməmişdir. Əliyə atdığı bu böhtan onun üçün yetərlidir. Yetərlidir ki, o, Əlini Peyğəmbərin ﷺ göstərişlərini həyata keçirməməkdə ittiham edir."[3]

Habelə "Tarix Diməş" əsərində rəvayət edilir ki, Əbu İbrahim Muhəmməd ibn əl-Qasim əl-Əsədi demişdir: "Osmanın ölümü xatırlandığı zaman mən Abdullah ibn Həsən ibn Əlinin saqqalı və paltarı yaş olana qədər ağladığını görmüşəm."[4]

---

[1] "Tarix Diməşq" əsəri, 29/256-256

[2] "Tarix Diməşq" əsəri, 29/255

[3] "Tarix Diməşq" əsəri, 29/256

[4] "Tarix Diməşq" əsəri, 29/256

# İmam Cəfər əs-Sadiqin verdiyi təriflər

İmam Cəfər əs-Sadiq bir dəfə Peyğəmbərin ﷺ səhabələrini vəsf edərək demişdir: "Peyğəmbərin on iki min səhabəsi var idi. Onlardan səkkiz mini Mədinəli, iki mini Məkkəli, digər iki mini isə Məkkənin fəthi zamanı əfv olunanlardan idi. Onların arasında qədəri, murciə, həruri, mötəzili və ya rəy əhli olmamışdı. Onlar gecə-gündüz ağlayaraq deyərdilər: "Allahım! Yeni bişmiş çörəyi dadmamışdan öncə canımızı al."[1]

Əgər səhabələr arasında qədəri, murciə, həruri, mötəzili və ya rəy əhli olmamışdırsa – bəzilərinin iddia etdiyi kimi – onların arasında bunlardan daha təhlükəli hesab olunan münafiq necə ola bilərdi?!

İmam Sadiqin bu rəvayətdə söylədiyi sözlər Peyğəmbərin ﷺ səhabələrini tərif edən, habelə onları Allahın razılığı və əbədi qalacaqları cənnəti ilə müjdələyən Qurani Kərimdəki ayələrin təsdiqidir. Bütün bu deyilənlər hara, sayları əldəki barmaqların sayından çox olmayan bir neçə səhabə istisna olmaqla bütün səhabələrin mürtəd olduğunu iddia edən batil rəvayətlər hara?!

Bir gün Mənsur ibn Hazim İmam Cəfər əs-Sadiqdən Peyğəmbərin ﷺ səhabələri barədə soruşub dedi: "Bəzən mən səndən bir məsələ barəsində soruşduqda mənə bir cavab verirsən, başqası gəlib soruşduqda isə ona başqa cür cavab verirsən?" O dedi: "Biz bəzi insanlara uzun, bəzilərinə isə qısa cavab veririk." O yenə soruşdu: "Mənə Peyğəmbərin ﷺ səhabələri barədə xəbər ver görüm, onlar Muhəmmədə sadiq oldular, yoxsa onu yalanladılar?" O buyurdu: "Əlbəttə ki, sadiq oldular." O yenə soruşdu: "Bəs nə üçün ixtilaf etmişdilər?" O buyurdu: "Məgər bilmirsən ki, bəziləri gəlib Peyğəmbərdən ﷺ bir məsələ barəsində soruşar, o da ona cavab verərdi. Bu cavabdan bir müddət sonra isə bəzi hədislər bir-birilərini nəsx edərdi.[2]"[1]

[1] "əl-Xisal" əsəri, səh. 638, № 15; "Bihar əl-Ənvar" əsəri, 22/305

[2] Şəriət hökmləri nazil olduğu (Peyğəmbərin ﷺ sağ olduğu) zamanda olurdu ki, bir hökm nazil olar, bundan bir müddət sonra isə başqa bir hökm onu

Bu da İmam Cəfər əs-Sadiqdən Peyğəmbərin ﷺ səhabələrinin sədaqətli olmalarına dair şahidlikdir.

Necə şahidlik etməsin, axı onun özü babası Muhəmməddən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Vida həccində Minada Xayf məscidində insanlara xütbə vermiş, Allaha həmd sənalar etdikdən sonra belə demişdi: "Mənim sözlərimi eşidib, onu mənimsəyən, sonra da onu eşitməyənlərə çatdıran kəslərin Allah üzlərini nurlandırsın. Bəzən elə olur ki, fiqhi öyrənmiş kəs fəqih olmur, bəzən də elə olur ki, öyrənən kəs öyrədəndən daha çox anlayışlı olur. Üç şeydə müsəlmanın qəlbi xəyanət etməz: Əməli Allah üçün səmimi qəlbdən etmək, müsəlmanların rəhbərlərinə nəsihət etmək və onların camaatlarına tabe olmaq. Onların etdikləri dualar onları əhatə edəcəkdir. Müsəlmanlar qardaşdırlar, onlardan ən zəifi belə bir zimmidən əhd almış olsa *digərləri də* onun qanını qorumalıdır. Həmçinin müsəlmanlar başqalarına qarşı birlikdə olmalıdırlar."[2]

Peyğəmbərin ﷺ öz sözlərinin təbliğini səhabələrə etibar etməsi onların dürüst və sadiq insanlar olmasına açıq-aşkar dəlillərdir.

Bu xüsusda imam Cəfər əs-Sadiq babası İmam Əlinin رضي الله عنه bu vəsiyyətini əzbərləmişdir: "Mən sizlərə Peyğəmbərinizin ﷺ səhabələrini tövsiyə edirəm, onları təhqir etməyin. Onlar Peyğəmbərdən ﷺ sonra dinə heç bir yenilik gətirməmiş və yenilik gətirmiş birisini də dəstəkləməmişlər. Peyğəmbərin ﷺ özü də onları tövsiyə edib."[3]

Bəssam əs-Seyrafinin belə dediyi rəvayət olunur: "Mən Cəfər əs-Sadiqdən Əbu Bəkr və Ömər barədə soruşduqda o, belə cavab verdi: "Vallahi ki, mən onları özümə dost tutur, onlar üçün bağış-

---

nəsx edərdi. Necə ki, Uca Allah buyurur: **"Biz *hər hansı* bir ayəni nəsx edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk."** (əl-Bəqərə surəsi, 106). Odur ki, bəzi səhabələrə yalnız nəsx olunmuş hökmlər çatardı. Onlar nəsx edən hökmlərdən isə bixəbər olardılar. Bu səbəbdən də onlar رضي الله عنهم bildikləri hökmə uyğun cavab verərdilər.

[1] "Usul əl-Kafi" əsəri, 1/52, "Elmin fəziləti" fəsli

[2] "əl-Xisal" əsəri, səh. 149-150, 172 saylı hədis

[3] "Bihar əl-Ənvar" əsəri, 22/306

lanma diləyirəm. Əhli-beytdən mənim tanıdığım hər kəs də onları özlərinə dost tutmuşlar."[1]

Cəfər ibn Muhəmməd öz atalarından ﷺ Rəsulullahın ﷺ belə dediyini rəvayət etmişdir: "Sirat körpüsündə ən çox sabit olanlarınız əhli-beytimi və səhabələrimi daha çox sevənlərinizdir."[2]

Allahım bizləri onların hamısını möhkəmcə sevən qullarından et və bizi onlarla birlikdə həşr et! Ey Mərhəmətlilərin Mərhəmətlisi!

## İmam Musa əl-Kazımın verdiyi təriflər

İmam Musa ibn Cəfər də öz babası Peyğəmbərdən ﷺ bu sözləri əzbərləmişdir: "Mən səhabələrim üçün bir əmin-amanlığam. Mən öldükdən sonra, vəd olunmuş müsibətlər səhabələrimə yaxınlaşmış olacaq. Həmçinin səhabələr də ümmətim üçün bir əmin-amanlıqdır. Onlar da öldükdən sonra, vəd olunmuş müsibətlər ümmətimə yaxınlaşmış olacaq. Nə qədər ki məni görənlər sizin aranızdadır bu din bütün başqa dinlər üzərində hakim olacaqdır."[3]

Həmçinin o, öz babalarından Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Dörd dövr vardır. Mən həmin dövrlərin ən əfzəlindəyəm. Sonra ikinci, daha sonra üçüncü dövr gələcək. Dördüncü dövr gəldikdə isə kişilər kişilərlə, qadınlar isə qadınlarla görüşəcək. Bu zaman Allah öz kitabını Adəm övladlarının köksləründən siləcək. Sonra Allah qara bir külək göndərəcək və Allahan başqa heç kim sağ qalmayacaq. Allah hamının canını alacaq."[4]

Bu hədis açıq-aydın dəlildir ki, səhabələrin dövrü ən əfzəl dövrdür. Bu baxımdan həmin fəzilətli dövrə tənə vurmaq olmaz.

---

[1] "Siyər Əlam ən-Nubələ" əsəri, 4/403

[2] "Bihar əl-Ənvar" əsəri, 27/133

[3] "Bihar əl-Ənvar" əsəri, 22/309; Bax: "Nəvadir ər-Ravəndi" əsəri, səh. 23; Muslimin "Səhih" əsərində də Əbu Musa əl-Əşaridən buna yaxın mənalı hədis varid olmuşdur, № 6466

[4] əl-Məclisinin "Bihar əl-Ənvar" əsəri, 22/309, "İhya ət-Turas əl-Arabi" yayım evi, Beyrut; Buxarinin "Səhih" əsərində № 2509, və Muslimin "Səhih" əsərində № 2533, buna yaxın rəvayətlər vardır

## İmam Əli ər-Rıdanın verdiyi təriflər

İmam Əli ər-Rıdanın da səhabələr barədə mövqeyi ata-babalarının mövqeyindən fərqli olmamışdır. O demişdir: "Allah Musa ibn İmranı seçib peyğəmbər göndərdikdə, dənizi onun üçün yarıb İsrail oğullarını xilas etdikdə, ona Tövratı və lövhələri bəxş etdikdə o, özünün Uca Rəbbi yanındakı məqamını görərək belə demişdi: "Ey Rəbbim! Əgər Muhəmmədin ailəsi də belədirsə, onda Sənin dərgahında peyğəmbərlərin səhabələri arasında mənim səhabələrimdən daha hörmətli olanı varmı?" Uca Allah buyurdu: "Ey Musa! Məgər bilmirsən ki, Muhəmmədin ﷺ səhabələrinin digər peyğəmbərlərin səhabələri üzərindəki fəzilətləri, Muhəmmədin ﷺ ailəsinin digər peyğəmbərlərin ailələri üzərindəki fəziləti, habelə Muhəmmədin ﷺ digər peyğəmbərlər üzərindəki fəziləti kimidir?" Musa dedi: "Ey Rəbbim! Kaş ki, onları görəydim!" Allah da ona belə vəhy etdi: "Ey Musa! Sən onları görə bilməyəcəksən. Çünki onlar indiki vaxtda zühur etməyəcəklər. Lakin sən onları Ədn və Firdovs cənnətlərində görəcəksən. Onlar orada Muhəmmədlə birlikdə cənnət temətləri arasında dolaşacaq və onlardan bəh-bəhlə istifadə edəcəklər."[1]

İmamdan nəql olunan bu rəvayət sübut edir ki, bu fəzilət istisnasız Peyğəmbərin ﷺ bütün səhabələrinə şamil olunur. Allah onların hər birindən razıdır. Əgər belə olmasaydı Peyğəmbərimizin ﷺ səhabələri digər peyğəmbərlərin səhabələri üzərində fəzilət sahibi olmazdılar.

## İmam Həsən ibn Muhəmməd əl-Əskərinin verdiyi təriflər

İmam əl-Əskər Rəsulullahın ﷺ belə dediyini rəvayət etmişdir: "İzzət və Cəlal sahibi olan Allah Musa ibn İmranı seçib peyğəmbər göndərdikdə, dənizi onun üçün yarıb İsrail oğullarını xilas et-

[1] "Bihar əl-Ənvar" əsəri, 13/340; "Təvil əl-Ayət" səh. 411

dikdə, ona Tövratı və lövhələri bəxş etdikdə o, özünün İzzət və Cəlal sahibi olan Rəbbi yanındakı məqamını görmüş oldu və dedi: "Ey Rəbbim! Həqiqətən də Sən Öz Lütfündən mənə elə bir şey bəxş etdin ki, bunu məndən öncə heç kəsə bəxş etməmisən." İzzət və Cəlal Sahibi olan Allah buyurdu: "Ey Musa! Məgər bilmirsən ki, mənim üçün Muhəmməd bütün mələklərdən və məxluqatdan daha xeyirlidir?" Musa dedi: "Ey Rəbbim! Əgər Muhəmməd ﷺ bütün məxluqatdan daha xeyirlidirsə, bəs peyğəmbərlərin ailələrindən mənim ailəmdən əfzəl olanı varmı?" İzzət və Cəlal Sahibi olan Allah buyurdu: "Ey Musa! Məgər bilmirsən ki, Muhəmmədin ﷺ ailəsinin digər peyğəmbərlərin ailələri üzərindəki fəzilətləri, Muhəmmədin ﷺ digər peyğəmbərlər üzərindəki fəziləti kimidir?" Musa dedi: "Ey Rəbbim! Əgər Muhəmmədin ailəsi də belədirsə, onda Sənin dərgahında peyğəmbərlərin səhabələri arasında mənim səhabələrimdən daha hörmətli olanı varmı?" İzzət və Cəlal Sahibi olan Allah buyurdu: "Ey Musa! Məgər bilmirsən ki, Muhəmmədin ﷺ səhabələrinin digər peyğəmbərlərin səhabələri üzərindəki fəzilətləri, Muhəmmədin ﷺ ailəsinin digər peyğəmbərlərin ailələri üzərindəki fəziləti, habelə Muhəmmədin ﷺ digər peyğəmbərlər üzərindəki fəziləti kimidir?"[1]

Bu, Peyğəmbərin pak əhli-beytinin insanların ən xeyirliləri sayılan səhabələrə verdikləri təriflərin cüzi bir hissəsi hesab oluna bilər.

Əhli-beytlə səhabələr arasında bu cür xoş münasibət var idi. Bütün bunları oxuduqdan sonra yəqin ki, bəzi müsəlmanların qəlbindəki saxta buzlar əriyərək suya dönəcək. Amma əfsuslar olsun ki, iş o yerə çatıb ki, bəziləri Əhli-beyti sevməyi səhabələrə nifrət etməkdə görürlər. Bununla onlar əvvəldə əsas mənbələrdən gətirdiyimiz dəlillərə əsasən Əhli-beytin hidayətinə müxalif mövqe sərgiləmiş olurlar.

Əgər qeyd olunan bu saxta buz ərimiş olsa ümmətimiz istədiyimiz birliyə nail olar.

[1] İmam əl-Əskərinin "Təfsir" əsəri, səh. 31

# Üçüncü fəsil

# Səhabələrin Rəsulullahın صلى الله عليه وآله وسلم əhli-beytinə verdikləri təriflər

# Rəsulullahın ﷺ xəlifəsi Əbu Bəkr əs-Siddiqin رضي الله عنه verdiyi təriflər

Budur, Əbu Bəkr əs-Siddiq رضي الله عنه həm özünə həm də əhli-beytə layiqli şəkildə onları tərif edir. Buxarinin "Səhih" əsərinə[1] nəql olunan hədisdə Əbu Bəkr رضي الله عنه Əliyə رضي الله عنه belə demişdir: "Canım Əlində olan Allaha and olsun ki, Rəsulullahın ﷺ qohumları ilə əlaqə saxlamağım, öz qohumlarımla əlaqə saxlamağımdan daha sevimlidir."

Həmçinin rəvayət olunur ki, İbn Ömər رضي الله عنهما Əbu Bəkrin رضي الله عنه belə dediyini rəvayət etmişdir: "Muhəmmədi ﷺ əhli-beyti vasitəsi ilə təqib edin."[2]

Əbu Yalənin "Musnəd" əsərində Uqbə ibn əl-Harisin belə dediyi rəvayət olunur: "Rəsulullahın ﷺ vəfatından bir neçə gecə sonra bir dəfə Əbu Bəkr رضي الله عنه əsr namazını qıldıqdan sonra çıxıb gəzməyə başladı. Bu vaxt o, Həsənin رضي الله عنه uşaqlarla oynadığını gördü və onu çiyninə otuzdurub dedi: "Atam sənə qurban! Ey Əliyə deyil, Peyğəmbərə oxşayan." Həmin vaxt Əli رضي الله عنه kənardan onu izləyib gülürdü."[3]

Hədisdə "Rəsulullahın vəfatından bir neçə gecə sonra" ifadəsi bəzi tarix kitablarında Əlinin رضي الله عنه Əbu Bəkrə رضي الله عنه beyət etməməsi və bir neçə aylıq camaatdan ayrı düşməsi fikrini alt-üst edir. Şübhəsiz ki, bu fikir batil və əsassızdır və Əlinin məqamına da yaraşmayan fikirlərdir. Onun səhabə qardaşlarını tərk etməsi, camaatı parçalaması və ya iddia olunduğu kimi öz haqqı olan xilafətdən imtina etməsi fikri mümkünsüzdür.

[1] Buxarinin "Səhih" əsəri, "Peyğəmbərin ﷺ qohumlarının tərifəlayiq xüsusiyyətləri" fəsli, № 3712; "Bihar əl-Ənvar" əsəri, 43/301

[2] Buxarinin "Səhih" əsəri, "Həsən və Hüseynin رضي الله عنهما tərifəlayiq xüsusiyyətləri" fəsli, № 3713

[3] Əbu Yalənin "Musnəd" əsəri, № 38, ("əl-Məmun Litturas" yayın evinin nəşri 1984, Hüseyn Səlim Əsidin təhqiqi. Kitabı təhqiq edən hdisin isnadının "səhih" olduğunu demişdir). Hədisin əsli Buxarinin "Səhih" əsərində varid olmuşdur, № 3542; "Kəşf əl-Ğummə fi Mərifəti əl-Əimmə" əsəri, 2/16

Çünki bütün səhabələr, o cümlədən Əli ibn Əbu Talib və Zubeyr ibn əl-Əvvam o zaman Əbu Bəkr əs-Siddiqin xəlifəliyinə hamılıqla beyət etmişdilər. Dəlil kimi Beyhəqinin öz isnadı ilə Əbu Səid əl-Xudridən rəvayət etdiyi bu hədisi göstərmək olar. Əbu Səid əl-Xudri demişdir: “Peyğəmbər dünyasını dəyişdikdən bir müddət sonra səhabələr Səd ibn Ubədənin evinə toplandılar. Onların arasında Əbu Bəkr və Ömər də var idi. Bu zaman ənsarlardan bir nəfər qalxıb danışmağa başladı və dedi: “Siz bilirsiniz ki, biz Rəsulullahın ənsarlarıyıq. Demək biz onun ənsarları olduğumuz üçün xəlifə də bizdən olmalıdır.” Bu zaman Ömər ibn əl-Xəttab ayağa qalxıb dedi: “Doğru deyirsiniz, bundan başqa bir söz demiş olsaydınız əsla sizə beyət etməzdik.” Bunu dedikdən sonra o, Əbu Bəkrin əlindən tutub dedi: “Bu, sizin dostunuzdur, ona beyət edin.” Beləliklə Ömər ona beyət etdi, sonra da mühacirlər və ənsarlar ona beyət etdilər. Sonra Əbu Bəkr minbərə çıxaraq insanların üzlərinə nəzər saldı və Zubeyri görmədi. O, Zubeyri çağırtdırıb dedi: “Ey Peyğəmbərin bibisi oğlu! Müsəlmanların arasında ayrıseçkilik etmək istəyirsən?” O dedi: “Məni qınama ey Rəsulullahın xəlifəsi.” Bunu dedikdən sonra o, gəlib Əbu Bəkrə beyət etdi. Sonra o, yenə də insanların üzünə nəzər salaraq Əlini görmədi. O, Əli ibn Əbu Talibi də çağırtdırdı və dedi: “Ey Peyğəmbərin əmisi oğlu və kürəkəni! Müsəlmanlar arasında ayrıseçkilikmi salmaq istəyirsən?” Əli dedi: “Məni qınama ey Rəsulullahın xəlifəsi.” Bunu dedikdən sonra o, gəlib Əbu Bəkrə beyət etdi. Hafiz Əbu Əli ən-Nisaburi demişdir: “Mən İbn Xuzeymənin belə dediyini eşitmişəm: “Bir dəfə Muslim ibn əl-Həccac mənim yanıma gələrək məndən bu hədis barədə soruşdu. Mən bu hədisi onun üçün bir vərəqə yazıb oxudum.” O dedi: “Bu hədisə görə gərək bir dəvə kəsilsin.” Mən dedim: “Bir dəvəyə deyil, bir kisə qızıla bərabərdir.” Hədisi İmam Əhməd “Musnəd” əsərində müxtəsər olaraq, Hakim isə “Mustədrək” əsərində qeyd olunduğu kimi tam şəkildə Əffan ibn Muslimdən, o da Vuheybdən rəvayət etmişdir.”[1]

[1] “əl-Bidayə vən-Nihayə” əsəri, 6/301

Hafiz İbn Kəsirin sözləri burada bitir. Bu hadisə Aişədən ﵂ nəql olunan hədislə ziddiyyət təşkil etmir. Belə ki, o, Əlinin ﵁ Peyğəmbərin ﷺ vəfatından altı ay sonra beyət etdiyini demişdir. Ona görə ziddiyyət yoxdur ki, Aişə ﵂ öz bildiyini danışmış, Əbu Səid əl-Xudri ﵁ də öz bildiyini danışmışdır. Qaydaya əsasən bilən kəsin sözü bilməyəninkindən daha üstün hesab olunur.

Həmçinin əd-Daraqutni "Fədail əs-Sahəbə va Mənaqibuhum" əsərində, öz isnadı ilə Abdullah ibn Cəfərin ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Əbu Bəkrə rəhmət eləsin! O, bizim rəhbərimiz idi, necə də gözəl rəhbər idi. Ondan daya yaxşı tərbiyəçi görmədik.[1] Bir dəfə biz onunla birlikdə evdə oturmuşduq. Bu zaman Ömər ﵁ gəlib izin istədi. O, üç dəfə izin istədi. Birinci dəfə izn istədikdə ona izn verilmədi. O ikinci dəfə yenə izn istədi. Bu dəfə də ona izin verilmədi. O üçüncü dəfə izn istədikdə Əbu Bəkr ﵁ ona dedi: "İçəri gir!" Ömər ﵁ Peyğəmbərin bir neçə səhabəsi ilə birlikdə içəri daxil oldu. Ömər ﵁ Əbu Bəkrə ﵁ dedi: "Ey Rəsulullahın ﷺ xəlifəsi! Bizi nə üçün qapıda gözlətdin? Biz iki dəfə izn istədik amma izn verilmədi, yalnız üçüncü dəfədə izn verildi." Əbu Bəkr ﵁ dedi: "Cəfərin övladları yemək yeyirdilər. Odur ki, gəlib onların yeməyinə həmşərik olacağınızdan qorxdum."[2]

Bu hədis Əbu Bəkrin Cəfərin ﵄ övladlarına qarşı nə qədər qayğı göstərdiyinə və onları qoruduğuna dəlildir.

## Möminlərin əmiri Ömər ibn əl-Xəttabın ﵁ verdiyi təriflər

Şübhəsiz ki, əhli-beytlə Ömər əl-Faruq ﵁ arasında yüksək səviyyəli əlaqələr mövcud olmuşdur. Bunun da ən bariz göstəricisi

---

[1] Belə ki, Abdullah ibn Cəfərin anası Əsma bint Umeys ﵂ Cəfər şəhid olduqdan sonra Əbu Bəkrə ﵁ ərə getmiş və ondan Muhəmmədi dünyaya gətirmişdi. Əbu Bəkrin ﵁ vəfatından sonra isə o, Əli ibn Əbu Talibə ﵁ ərə getmiş və ondan da dünyaya uşaq gətirmişdir

[2] əd-Daraqutninin "Fədail əs-Sahəbə va Mənaqibuhum" əsəri, mövcud olan on birinci cüz, "Məktəbətu əl-Ğutəba əl-Əsəriyyə" nəşri. Mədinə şəhəri

kimi, onların bir-birilərinə verdikləri tərifləri, Ömərin Əlinin qızı Ummu Gülsümlə izdivacını, əhli-beytin öz övladlarına Ömər adını verməsini göstərmək olar. Həmin dəlillərin birində, Buxarinin Ömərdən رضي الله عنه rəvayət etdiyi hədisdə deyilir ki, Ömər ibn əl-Xəttab رضي الله عنه quraqlıq olarkən *Peyğəmbərin əmisi* Abbas ibn Abdulmuttalibin vasitəsi ilə təvəssül edərək demişdir: "Allahım əvvəllər biz Peyğəmbərimizin ﷺ vasitəsi[1] ilə səndən yağış diləyir, Sən də bizə yağış yağdırırdın. İndi isə biz Peyğəmbərin ﷺ əmisi vasitəsi[2] ilə səndən yağış diləyirik, bizlər üçün yağış yağdır." Beləcə yağış yağardı."[3] Buradan görürük ki, Ömər رضي الله عنه Peyğəmbərin ﷺ əmisi Abbasın رضي الله عنه sağlığında onun duası vasitəsi ilə Allaha təvəssül edərdi. Necə ki, bundan əvvəl səhabələr Peyğəmbərin ﷺ sağlığında onun duası vasitəsi ilə təvəssül edərdilər.

İbn Sədin "ət-Təbəqat" əsərində rəvayət olunur ki, Ömər رضي الله عنه Abbas ibn Abdulmuttalibə belə demişdir: "Vallahi ki, mənim üçün sənin İslamı qəbul etməyin (atam) Xəttabın İslama gəlməsindən daha sevimli idi. Çünki, Rəsulullah ﷺ üçün sənin İslamı qəbul etməyin, Xəttabın İslamı qəbul etməsindən daha sevimli idi."[4]

Ömərin Əlini tərif etməsi barədə İmam Əhmədin "Fədail əs-Səhabə" əsərində, (№ 1089) Urva ibn Zubeyrdən belə rəvayət olunur: "Bir dəfə Ömərin hüzurunda bir nəfər Əli ibn Əbu Talib barəsində nalayiq söz işlətdi. Bunu eşidən Ömər ona dedi: "Sən bu məzarın sahibini tanıyırsanmı? O, Muhəmməd ibn Abdullah ibn Abdulmuttalibdir. Əli ibn Əbu Talib də Abdulmuttalibin nəvəsidir. Odur ki, Əli barədə yalnız xeyirli söz söylə. Şübhəsiz ki, sən əgər

---

[1] Peyğəmbər ﷺ həyatda ikən onun duası vasitəsi ilə təvəssül olunurdu. Peyğəmbər ﷺ vəfat etdikdən sonra isə onun qohumu olduğuna görə Abbasın رضي الله عنه duası vasitəsi təvəssül olundu

[2] Peyğəmbər ﷺ həyatda ikən onun duası vasitəsi ilə təvəssül olunurdu. Peyğəmbər ﷺ vəfat etdikdən sonra isə onun qohumu olduğuna görə Abbasın رضي الله عنه duası vasitəsi təvəssül olundu

[3] Buxarinin "Səhih" əsəri, № 1010, "Abbas ibn Abdulmuttalibin zikr olunması" fəsli

[4] "ət-Təbəqat əl-Kubra" əsəri, 4/23; "əl-Bidayə vən-Nihayə" əsəri, 2/298

onu hisrləndirmiş olsan, bu məzarın sahibinə əziyyət vermiş olacaqsan."[1]

İbn Abdulbərrin "əl-İstiyab" əsərində nəql olunan hədisdə Ömər ﵁ demişdi: "Aramızda ən yaxşı qazi Əlidir."[2]

İbn Əsakirin "Tarix Diməşq" əsərində nəql olunur ki, Ömər ibn əl-Xəttab ﵁ Divan toplantısında pay və əmək haqlarını təyin edərkən Həsən və Hüseynə ﵄ Bədr əhlindən olan ataları Əliyə ﵁ təyin olunduğu qədər müəyyən etdi. Çünki onların hər ikisi Rəsulullahın ﷺ əhli-beytindən idilər. Odur ki, onların hər biri üçün beş min təyin etdi."[3]

İbn Səd bu rəvayəti tam variantda öz isnadı ilə Cubeyr ibn əl-Huveyris ibn Nəqiddən nəql etmişdir. Rəvayətdə deyilir ki, bir dəfə Ömər ibn əl-Xəttab Divan toplantısında müsəlmanlarla məşvərət edirdi. Bu zaman Əli ibn Əbu Talib ona dedi: "Hər il toplanan bütün malı paylayıb bitirirsən, gələcək üçün isə bir şey saxlamırsan." Osman ibn Əffan isə belə dedi: "Mənim fikrimcə mal, insanların hamısına çatacaq qədər çoxdur. Lakin bunun qeydiyyatı aparılmır deyə, bilmirik ki, kimə verilib, kimə yox. Qorxuram ki, bu insanlar arasında da yayıla." Bu zaman Vəlid ibn Hişam ibn əl-Muğira dedi: "Ey möminlərin əmiri! Mən Şama getdiyimdə oranın rəhbərlərinin toplantı keçirdiklərinin şahidi olmuşam. Onlar toplantı zamanı yazaraq insanları qeydiyyata alırdılar. Sən də belə et." Ömər onun bu sözü ilə razılaşaraq Qureyşin əsilzadə şəxslərindən olan Əqil ibn Əbu Talibi, Məxrəmə ibn Nəufəli, Cubeyr ibn Mutimi yanına çağırıb dedi: "İnsanları səviyyələrinə görə bölün." Onlar da yazmağa başladılar. İlk öncə Haşim oğullarını, sonra Əbu Bəkr və onun yaxınlarını, sonra Öməri və onun xilafətdəki yaxınlarını yazıb qeyd etdilər. Ömər siyahıya nəzər saldıqda dedi: "Vallahi ki, mən də belə düşünürdüm. Lakin ilk öncə Peyğəmbərin ﷺ ən yaxın qohumlarından başlayaraq tədricən bütün qohumlarını yazın. Ömərin adını isə Allahın onu təyin etdiyi yerə

---

[1] Kitabı təhqiq etmiş Vasiyyullah Abbas bu rəvayəti səhih hesab etmişdir

[2] "əl-İstiyab" əsəri, 1871 saylı tərcümeyi-hal

[3] İbn Əsakirin "Tarix Diməşq" əsəri, 14/1790

qoyun." Muhəmməd ibn Ömər demişdir: "Usamə ibn Zeyd ibn Əsləm öz atasından, o da babasından rəvayət edərək demişdir: "Mən gördüm ki, siyahı Ömərə göstərildikdə o, Teym oğullarının Haşimi oğullarından sonra, Adiy oğullarının da Teym oğullarından sonra qeyd olunduğunu gördü. Elə bu zaman mən onun belə dediyini eşitdim: "Öməri öz yerinə qoyun və daha yaxın olanlardan başlayın." Bu zaman Adiy oğulları Ömərin yanına gəlib dedilər: "Sən Rəsulullahın xəlifəsisən və ya Əbu Bəkr Rəsulullahın xəlifəsidir, sən də Əbu Bəkrin xəlifəsisən. Yaxşı olar ki, onlar səni hansı məqama layiq biliblərsə sən də adının həmin yerdə olmasına etiraz etməyəsən." O dedi: "Bəh bəh! Ey Adiy oğulları! İstəyirsiniz ki, mənim kürəyim üzərindən yemək yeyəsiniz və mən də sizə görə savablarımı itirim? Vallahi ki, xeyr. Sizlər dəvət olunanadək gözləyin. Hətta dəftər üzünüzə bağlansa belə, yəni, mənim adımı ən sonda yazmış olsanız belə, bilin ki, mənim iki dostum var ki, onların getdikləri yola müxalif olsam, mənə də müxalif olarlar. Vallahi ki, dünyada əldə etdiyimiz elə bir fəzilət, habelə axirətdə əldə etməyə çalışdığımız Allahın elə bir mükafatı yoxdur ki, onu Muhəmmədin ﷺ sayəsində əldə etmiş olmayaq. Şübhəsiz ki, o, bizim şərəfimizdir. Onun qövmü isə ərəblərin ən şərəflilərididir."[1]

Zəhəbinin "Siyər Əlam ən-Nubələ" əsərində nəql olunur ki, bir dəfə Ömər رضي الله عنه səhabələrin övladlarına libas paylayırdı. Lakin həmin libaslar Həsənlə Hüseyn رضي الله عنهما üçün layiqli deyildi. Odur ki o, Yəmənə bir nəfər göndərdi ki, onlar üçün xüsusi libas gətirsin. Libas gəlikdən sonra Ömər dedi: "Bax indi nəfsim rahat oldu."[2] Bir bax gör – Allah sənə rəhm etsin – Ömər رضي الله عنه Həsənlə Hüseynə رضي الله عنهما necə diqqət və qayğı göstərər, hətta libas aldıqda da başqalarından fərqli libas alar, onları adi insanlarla eyni tutmazdı.

İbn Əsakirin "Tarix Diməşq" əsərində rəvayət olunur ki, bir dəfə Ömər رضي الله عنه Hüseynə belə dedi: "Oğlum! Bəlkə gəlib bizləri də ziyarət edəsən." Hüseyn dedi: "Bir gün Ömər Müaviyə ilə təkbətək görüşərkən mən onlara getdim. Həmin vaxt İbn Ömər qapıda

[1] "ət-Təbəqat əl-Kubra" əsəri, 3/295-296

[2] "Siyər Əlam ən-Nubələ" əsəri, 3/285; "Tarix Diməşq" əsəri, 14/180

idi. Onun içəri daxil olmasına izin verilmədi. Odur ki, mən geri qayıtdım. Bir müddət sonra o, məni görüb yenə soruşdu: "Oğlum niyə bizə gəlmədin?" Hüseyn dedi: "Sən Müaviyə ilə təkbətək görüşdə ikən mən gəlmişdim, qapıda isə oğlun Abdullah ibn Ömər durmuşdu. Onun qayıtdığını görüb mən də qayıtdım." Ömər dedi: "Sən Abdullah ibn Ömərdən fərqli olaraq izinsiz içəri daxil olmağa layiqsən. Sadəcə başımıza gördüklərini yeridirəm. Allah, sonra da siz." Bunu deyib Ömər əlini Hüseynin başına qoydu."[1]

Bir baxın görün –Allah sizə rəhm etsin – Hüseyn yaşca Ömərdən kiçik olmasına baxmayaraq Ömər ona qarşı xüsusi diqqət göstərirdi. Məgər bu Ömərin əhli-beytə nə qədər qayğı göstərməsinə və onların hamısını sevməsinə dəlil deyilmi?

Buxarinin "Səhih" əsərində Ömərin رضي الله عنه ümmətin alimi Abdullah ibn Abbası رضي الله عنهما tərif etdiyi barədə hədis nəql olunmuşdur. Hədisdə İbn Abbas رضي الله عنهما demişdir: "Ömər məni Bədr döyüşündə iştirak etmiş ağsaqqallarla eyni məclisə dəvət edərdi. Bu zaman bəziləri ondan soruşdular ki, bu yeniyetməni niyə bizimlə məclisə dəvət edirsən?" Ömər dedi: "O, bildiyiniz adamın nəslindəndir."[2]

İbn Abdulbərr nəql edir ki, Ömər رضي الله عنه İbn Abbasa رضي الله عنهما belə demişdir: "Abdullah ibn Abbas Quranın necə də gözəl tərcümanıdır." Həmçinin onunla qarşılaşdıqda deyərdi: "Bu yeniyetmə gəncin çoxlu sual soruşan dili, çox ağıllı qəlbi vardır."[3]

Hakimin "Mustədrək" əsərində Əli ibn Hüseyndən belə rəvayət olnur: "Ömər ibn əl-Xəttab رضي الله عنه Əlinin qızı Ummu Gülsümlə رضي الله عنها nişan göndərərkən Əliyə dedi: "İcazə ver onunla nikah bağlayım." Əli dedi: "Mən onu qardaşım oğlu Abdullah ibn Cəfər üçün nəzərdə tutmuşdum." Ömər dedi: "İcazə ver onunla nikah bağlayım. Allaha and olsun ki, heç kim mənim qədər ona dəyər verə bilməz." Beləliklə Əli razılaşdı. Ömər mühacirlərin yanına gələrək dedi: "Məni təbrik etməyəcəksinizmi?" Onlar dedilər: "Nə müna-

---

1 "Tarix Diməşq" əsəri, 14/179

2 Buxarinin "Səhih" əsəri, № 4294, "Məkkənin fəthi günü Peyğəmbərin ﷺ mənzili" fəsli

3 İbn Abdulbərrin "əl-İstiyab" əsəri, 1447 saylı tərcümeyi-hal

sibətlə ey möminlərin əmiri?" Mən Rəsulullahın ﷺ qızı Fatimənin övladı Ummu Gülsüm bint Əli ibn Əbu Taliblə nikah bağlamışam. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qiyamət günü mənim səbəbimdən və nəsəbimdən başqa bütün səbəblər və nəsəblər qırılacaqdır."[1]

Zəhəbinin "Siyər Əlam ən-Nubələ" əsərində Muhəmməd ibn Əli ibn əl-Hənəfiyyənin belə dediyi rəvayət olunur: "Mən bacım Ummu Gülsümün yanında ikən Ömər yanımıza daxil olub məni qucaqlayıb dedi: "Ona şirniyyat verməklə nəvaziş gösrət."[2]

Bax gör –Allah səni əfv etsin – əgər Ömər رضي الله عنه Əlini رضي الله عنه və onun zürriyyətini bu qədər sevmiş olmasaydı Muhəmməd ibn Əlini qucaqlamaz və bacısı Ummu Gülsümə şirniyyat verməsini istəməzdi.

## Möminlərin əmiri Osman ibn Əffanın رضي الله عنه verdiyi təriflər

Bu raşidi xəlifə də digər səhabə qardaşları kimi Rəsulullahın ﷺ əhli-beytinin fəzilətinə bələd idi. Bu səbəbdən də o, onlara layiqli şəkildə tərifləyərdi. Buna misal olaraq İbn Kəsirin "əl-Bidayə vən-Nihayə" əsərində nəql etdiyi bu rəvayəti gətirmək olar: "Ömər ibn əl-Xəttab və Osman ibn Əffan رضي الله عنهما miniyin üzərində ikən Abbasın رضي الله عنه yanından ötüb keçəndə ona hörmət əlaməti olaraq minikdən enib onun yanından piyada keçərdilər."[3]

İbn Kəsir رحمه الله demişdir: "Osman رضي الله عنه ibn Əffan Həsənlə Hüseynə رضي الله عنهما ehtiram göstərər və onları sevərdi. Osman evində mühasirədə olarkən Həsən ibn Əli də onun yanında idi. O qılıncını götürüb Osmanın müdafiəsində hazır vəziyyətdə durmuşdu. Amma Osman ona xətər toxuna biləcəyindən qorxub Allaha and verdi ki,

---

[1] Hakimin "Mustədrək" əsəri, 3/153, № 4684; Şeyx Albani "Silsilətu əl-Əhadis əs-Səhihə" əsərində, bu hədisin başqa isnadlarını da gətirərək onu "Səhih" hesab etmişdir 5/58, № 2036

[2] "Siyər Əlam ən-Nubələ" əsəri, 4/115

[3] "əl-Bidayə vən-Nihayə" əsəri, 7/162

çıxıb evinə getsin. O belə etmişdi ki, Əlinin qəlbi rahat olsun və Həsən heç bir zərər görməsin."[1]

## Talhə ibn Ubeydullahın ﵁ verdiyi təriflər

İbn Sədin "ət-Təbəqat" əsərində nəql olunur ki, xeyirxah insan sayılan Talhə ﵁ əhli-beytin ən xeyirlilərindən hesab olunan İbn Abbası ﵄ tərifləyərək demişdir: "İbn Abbasa həm fəhm, həm zəka, həm də elm verilmişdir."[2]

## Səd ibn Əbu Vəqqasın ﵁ verdiyi təriflər

Bir baxın görün Səd ﵁ Əli ﵁ haqqında nə qədər tərifəlayiq hədislər rəvayət etmişdir. Əgər o Əlini sevmiş olmasaydı bu cür rəvayətləri əsla yaymış olmazdı. Muslim Sədin ﵁ belə dediyini rəvayət etmişdir: "Rəsulullah ﷺ Təbuk döyüşünə yola düşərkən Əli ibn Əbu Talibi öz yerinə başçı təyin etdi. Onda Əli dedi: "Doğurdanmı sən məni qadınların və uşaqların yanında qoyub getmək istəyirsən?" Peyğəmbər ﷺ buyurdu: "Məgər istəmirsən ki, Harun Musaya yaxın olduğu kimi sən də mənə yaxın olasan? Fəqət məndən sonra peyğəmbər gəlməyəcək."[3]

Həmçinin Səd ibn Əbu Vəqqas ﵁ İbn Abbası ﵄ da tərifləmişdir. İbn Sədin "ət-Təbəqat əl-Kubra" əsərində Səd ibn Əbu Vəqqasın ﵁ belə dediyi rəvayət olunur: "Mən İbn Abbasdan daha anlayışlı, daha ağıllı, daha elmli və daha mehriban birisini görməmişəm. Mən şahidi olmuşam ki, Ömər çətinliklə üzləşdikdə İbn Abbası yanına çağırıb deyərdi: "Belə bir çətin məsələ ilə üzləşmişik, bizə yardım et." Sonra da onun dediyinə əməl edərdi. Halbuki, həmin vaxt Ömərin əhatəsində mühacir və ənsarlardan ibarət Bədr əhli var idi."[4]

---

1 "əl-Bidayə vən-Nihayə" əsəri, 8/36
2 "ət-Təbəqat" əsəri, 2/370
3 Səhih Muslim (6217), Buxari (4416).
4 "əl-Bidayə vən-Nihayə" əsəri, 8/303; "ət-Təbəqat" əsəri, 2/369

## Cabir ibn Abdullahın verdiyi təriflər

Cabirin əhli-beyt barədə təriflər söyləməsi onları nə dərəcədə sevməsinə dəlalət edir. İbn Əbu Şeybə öz isnadı ilə Atiyyə ibn Sədin belə dediyini rəvayət etmişdir: "Biz Cabir ibn Abdullahın yanına daxil oluqda onun qaşları gözlərinin üstünə düşmüşdü. Mən dedim: "Bizə Əli ibn Əbu Talib barədə xəbər ver!" O əli ilə qaşlarını qaldırıb dedi: "O, ən xeyirli insanlardandır."[1]

Həmçinin onun Hüseyni tərifləməsi barədə nəql olunan rəvayətdə deyilir ki, bir dəfə Hüseyn məscidə daxil olduqda Cabir dedi: "Kim Cənnət cavanlarının ən hörmətlisini görmək istəyirsə buna baxsın."[2] Cabir bu sözləri Peyğəmbə nisbət etdi.

İbn Sədin "ət-Təbəqat" əsərində deyilir ki, İbn Abbas vəfat etdikdə Cabir ibn Abdullah dedi: "Bu gün insanların ən savadlısı, ən çox anlayışlı olanı vəfat etmişdir. Bu gün ümmətimizə görünməmiş bir müsibət üz vermişdir."[3]

Muslim "Səhih" əsərində Cəfər ibn Muhəmməd ibn Əli ibn Hüseyn öz atasından onun belə dediyini rəvayət etmişdir: "Biz Cabir ibn Abdullahın yanına daxil olduqda o, bir-bir bizdən kim olduğumuzu soruşdu. Sonra növbə mənə çatdı və mən dedim: "Mən Muhəmməd ibn Əli ibn Hüseynəm." O, əli ilə başıma sığal çəkib köynəyimin yuxarıdakı və aşağıdakı düymələrini açdı. Daha sonra əlini sinəmə qoydu. O zaman mən hələ uşaq idim. O dedi: "Xoş gəlmisən ey qardaşım oğlu! İstədiyini soruş..."[4]

## Möminlərin anası Aişənin verdiyi təriflər

Aişənin özü Peyğəmbərin xanımı olduğu üçün əhli-beytdən sayılır. Qurani Kərimdə açıq-aşkar şəkildə qeyd olunur ki,

---

[1] İbn Əbu Şeybənin "əl-Musənnəf" əsəri, № 32120, "Məktəbətu ər-Ruşd" nəşri, ər-Riyad h. 1409

[2] "Siyər Əlam ən-Nubələ" əsəri, 3/282; Əbu Yələnin "Musnəd" əsəri, № 1874; Kitabı təhqiq edən Hüseyn Səlim Əsəd hədisin ravilərinin "Etibarlı" ravilər olduğunu söyləmişdir

[3] "ət-Təbəqat" əsəri, 2/372

[4] Muslimin "Səhih" əsəri, № 1218, "Peyğəmbərin həcci" fəsli

Peyğəmbərin ﷺ xanımları əhli-beytdəndirlər. Buna baxmayaraq biz Aişənin رضي الله عنها əhli-beytdən olan digər insanları necə tərif etdiyini qeyd edirik ki, onların arasında nə cür ülfət və məhəbbətin olduğunu göstərək.

Təbərinin tarixində Aişənin belə dediyi rəvayət olunur: "Vallahi ki, mənimlə Əli arasında əvvəllər baş vermiş olaylar sadəcə qadınla onun ən yaxın dostları arasında olan söz-söhbətdən başqa bir şey deyildir. Bütün bu baş verənlərə baxmayaraq o, mənim üçün ən xeyirli insanlardandır." Əli isə demişdir: "Ey insanlar, Vallahi ki, o doğru deyir. Bizim aramızda baş vermiş olaylar kiçik inciklikdən başqa bir şey olmayıb. Şübhəsiz ki, o, Peyğəmbəriniz Muhəmmədin ﷺ həm bu dünyada, həm də axirətdə xanımı olacaqdır."[1]

İbn Abdulbərr əl-Əndəlusinin "əl-İstiyab" əsərində[2] rəvayət olunur ki, bir dəfə Aişə soruşdu: "Aşura gününü oruc tutmaq barədə sizə fətvanı kim verib?" Onlar: "Əli"- deyə cavab verdilər. Aişə dedi: "Həqiqətən də o, insanlar arasında sünnəni ən çox biləndir."

Əbu Davud öz isnadı ilə möminlərin anası Aişənin رضي الله عنها belə dediyini rəvayət etmişdir: "Sözündə, danışığında, tutduğu yolda, oturuşunda və duruşunda Rəsulullaha ﷺ qızı Fatimədən daha çox oxşayan bir adam görməmişəm."[3]

Hakimin "Mustədrək" əsərində Aişənin belə dediyi rəvayət olunur: "Mən Fatimədən daha doğru danışan birisini görməmişəm. Yalnız onu dünyaya gətirən atası müstəsna."[4] Hakim hədisin Muslimin şərtinə uyğun olduğunu bildirmiş və Zəhəbi onunla razılaşmışdır.

Məclisinin "Bihar əl-Ənvar" əsərində nəql olunur ki, Əlinin xavaricləri qətlə yetirməsi xəbəri Aişəyə gəlib çatdıqda o, belə de-

---

[1] Təbərinin tarixi, 4/544

[2] "əl-İstiyab" əsəri, 1871 saylı tərcümeyi hal

[3] Əbu Davudun "Sünən" əsəri, № 5217. Şeyx Albani bu hədisi "Səhih ət-Tirmizi" (№ 3039) əsərində "Rəsulullahın ﷺ rızı Fatimənin رضي الله عنها fəziləti" fəslində səhih hesab etmişdir

[4] "Mustədrək" əsəri, 3/175, № 4756

mişdi: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Allahım, həqiqətən də onlar ümmətimin ən pisləridir. Ümmətimdən ən xeyirli olanlar[1] onlara qarşı mübarizə aparacaqlar.” Mənimlə Əlinin arasında olanlar isə sadəcə qadınla onun ən yaxın dostları arasında olan söz-söhbətdən başqa bir şey deyildir.”[2]

Əli رضي الله عنه Amr ibn Vuddu qətlə yetirdikdə Əbu Bəkr və Ömər رضي الله عنهما onun başından öpmüşdülər.[3] Həmçinin Aişə رضي الله عنها Fatiməyə رضي الله عنها belə demişdir: “Sənə bir müjdəm var. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Cənnət əhlinin qadınlarının ən hörmətlisi dörddür: İmranın qızı Məryəm, Rəsulullahın qızı Fatimə, Xuveylidin qızı Xədicə və Fironun həyat yoldaşı Asiya.”[4]

Əgər Aişə ilə Fatimə رضي الله عنهما arasında hər hansı bir münaqişə olmuş olsaydı əsla ona bu müjdəni verməzdi.

## Abdullah ibn Məsudun رضي الله عنه verdiyi təriflər

Bu gözəl təriflər silsiləsinə Abdullah ibn Məsudu رضي الله عنه da əlavə etmək istəyirik. İbn Abdulbərrin “əl-İstiyab” əsərində Abdullah ibn Məsudun رضي الله عنه belə dediyi nəql olunur: “Mədinə əhli arasında ən yaxşı hökm verən Əli ibn Əbu Talibdir.”[5]

Həmçinin o, demişdir: “Abdullah ibn Abbas Quranın necə də gözəl tərcümanıdır. Əgər o bizim qədər Peyğəmbərə ﷺ yoldaşlıq etmiş olsaydı, bizim heç birimiz onun bildiyinin ondan birini bilməzdi.”[6]

---

[1] Burada söhbət yalnız həmin zamanda yaşayan insanlardan gedir. Yoxsa ki, Peyğəmbərin ﷺ ümmətinin ən xeyirliləri əvvəldə qeyd etdiyimiz ən xeyirli üç əsrdir

[2] “Bihar əl-Ənvar” əsəri, 33/232; “Kəşf əl-Ğummə fi Mərifəti əl-Əimmə” əsəri, 1/158

[3] əl-Mufidin “əl-İrşad” əsəri, 55

[4] Hakimin “Mustədrək” əsəri, № 4853. Hakim bu hədisin isnadının Muslimin şərtinə uyğun olduğunu bildirmiş və Zəhəbi onunla razılaşmışdır

[5] “əl-İstiyab” əsəri, 1871 saylı tərcümeyi hal

[6] Hafiz İbn Həcər “Fəthul-bari” əsərində, 7/100 demişdir: “Bunu Yəqub ibn Süfyan özünün “Tarix” əsərində səhih isnadla İbn Məsuddan رضي الله عنه rəvayət etmişdir

# Abdullah ibn Ömərin ﵄ verdiyi təriflər

İbn Ömər ﵄ Əli ﵁ yanında olmadığı halda belə ona tənə edənlərdən onu müdafiə etmişdir. Necə ki, Buxarinin "Səhih" əsərində belə varid olmuşdur: "Bir dəfə bir nəfər İbn Ömərin yanına gəlib ondan Osman barəsində soruşdu. İbn Ömər də Osmanın yaxşı əməlləri barədə danışdı və sonra dedi: "Ola bilsin ki, bu söylədiklərim sənin xoşuna gəlməsin." Həmin şəxs: "Bəli" - deyə cavab verdi. İbn Ömər dedi: "Allah səni pisliyə salsın." Sonra həmin adam ondan Əli barəsində soruşdu. İbn Ömər Əlinin də yaxşı əməlləri barədə danışmağa başladı. Sonra dedi: "Bax belə bir insandır o. Onun evi Peyğəmbərin ﷺ evlərinin ortasında yerləşir." Sonra dedi: "Deyəsən bu da xoşuna gəlmədi." Həmin şəxs: "Bəli" – deyə cavab verdikdə o dedi: "Allah səni pisliyə salsın..."[1]

Həmçinin İbn Ömərin Hüseyn ibn Əlini ﵄ tərif etməsi barədə Buxarinin "Səhih" əsərində İbn Əbu Numin belə dediyi rəvayət olunur: "Bir dəfə mən Abdullah ibn Ömərin yanında ikən bir nəfər gəlib ondan *(ihramda olan adamın)* ağcaqan öldürməsi barəsində soruşdu. İbn Ömər dedi: "Sən kimlərdənsən?" Həmin adam dedi: "Mən İraq əhlindənəm." İbn Ömər dedi: "Bir buna baxın. Məndən ağcaqanadın qanı barədə soruşur. Halbuki özləri Rəsulullahın ﷺ övladını qətlə yetiriblər. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Onlar (yəni Həsənlə Hüseyn) mənim dünyadakı reyhan qoxulu əzizlərimdir."[2]

İbn Əsakirin "Tarix Diməşq" əsərində İbn Ömərlə Abdullah ibn Cəfər ibn Əbu Talib arasındakı gözəl əlaqələr barədə belə nəql olunur: "İbn Ömər vaxtaşırı Abdullah ibn Cəfərin yanına gələrdi. İş o yerə çatdı ki, insanlar ona belə dedilər: "Sən Abdullah ibn Cəfərin yanına yaman çox gedirsən." İbn Ömər dedi: "Siz onun atasını görmüş olsaydınız bunu sevərdiniz. Atası şəhid olarkən başından ayağınadək yetmiş qılınc və nizə yarası almışdı."[3]

---

[1] Buxarinin "Səhih" əsəri, № 3704, "Əli ibn Əbu Talibin fəzilətləri" fəsli

[2] Buxarinin "Səhih" əsəri, № 5994, "Ədəb" kitabı, "Uşağa rəhm etmək, onu öpmək və qucaqlamaq" fəsli

[3] "Tarix Diməşq" əsəri, 29/179

Yenə Buxarinin "Səhih" əsərində Şəbidən rəvayət olunur ki, İbn Ömər ﷺ Abdullah ibn Cəfərə salam verdikdə deyərdi: "Ey iki qanadlının oğlu, sənə salam olsun."[1]

## Misvar ibn Məxrəmənin ﷺ verdiyi təriflər

Misvar ibn Məxrəmənin ﷺ əhli-beytə verdiyi təriflər barədə İmam Əhmədin *"Musnəd" əsərində* belə rəvayət olunur: "Həsən ibn Həsən[2] Misvarın qızı ilə evlənmək üçün Misvara müraciət etdikdə o dedi: "Gecə yanıma gələrsən *bu barədə* danışarıq." Gecə onunla görüşdükə Misvar Allaha həm edib dedi: "Mənim üçün sizin nəsəbinizdən, nəslinizdən daha əziz olanı yoxdur. Lakin Rəsulullah ﷺ demişdir: "Fatimə mənim bir parçamdır. Onu sevindirən şey məni də sevindirir, habelə onu kədərləndirən şey məni də kədərləndirir. Qiyamət günü mənim səbəbimdən və nəsəbimdən başqa bütün səbəblər qırılacaqdır." *Sonra o dedi:* "Onun qızı isə səndədir.[3] Əgər mən qızımı sənə versəm bu onu qəzəbləndirər." Beləcə ondan üzrxahlıq etdi."[4]

Bax – Allah sənə rəhm etsin – bu səhabə Rəsulullahın ﷺ qızı Fatimənin – hətta onun ölümündən sonra belə necə hörmətini saxlamışdır. Belə ki, nəvəsi barədə Fatimənin hislərinə həssaslıqla yanaşır. Qızını öz dövründə Haşimilərin ən xeyirli övladı ilə evləndirmək fürsətini əldən qaçırır. Bundan daha ülvi məhəbbət ola bilərmi?

## Əbu Hureyranın ﷺ verdiyi təriflər

Əbu Hureyra ﷺ da əhli-beyt barədə xoş sözlər söyləmişdir. Tirmizi və Hakimin Əbu Hureyradan ﷺ rəvayət etdikləri hədis-

---

[1] Buxarinin "Səhih" əsəri, № 3709,"Cəfər ibn Əbu Talibin ﷺ tərifəlayiq xüsusiyyətləri" fəsli

[2] Bu, Həsən ibn Həsən ibn Əli ibn Əbu Talibdir. Ləqəbi Həsən əl-Musənnədir (qoşa Həsən)

[3] Hüseynin ﷺ qızı Fatimə onun xanımı idi

[4] İmam Əhmədin "Fədail əs-Səhabə" əsəri, № 1347; Hakimin "Mustədrək" əsəri, № 4747. Hakim bu hədisi Muslimin şərtinə əsasən "Səhih" hesab etmiş, Zəhəbi də onunla razılaşmışdır

də o, Cəfər ﵁ barədə belə demişdir: “Rəsulullahdan ﷺ sonra piyada və miniklə gəzənlər arasında Cəfər ibn Əbu Talibdən daha əfzəl birisi yoxdur.” Buxarinin “Səhih” əsərində bunun açıqlaması olaraq deyilir: “Yoxsullar üçün insanların ən xeyirlisi Cəfər ibn Əbu Talib idi.”[1]

Əbu Yələnin “Musnəd” əsərində Səid əl-Məqburidən rəvayət olunan hədisdə deyilir: “Bir dəfə biz Əbu Hureyra ﵁ ilə birlikdə olarkən Həsən ibn Əli ﵁ gəlib bizə salam verdi. Biz də ona cavab verdik. Əbu Hureyranın isə onun gəlişindən xəbəri olmadı. Sonra Həsən çıxıb getdi. Bu zaman biz ona dedik: “Ey Əbu Hureyra! Həsən ibn Əli gəlib bizə salam verdi.” Bunu eşitdikdə o tez gedib ona çatdı və dedi: “Sənə də salam olsun ey cənabım!” Sonra Əbu Hureyra ﵁ belə dedi: Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Həqiqən də o, seyiddir.”[2]

Hakim öz isnadı ilə Əbu Hureyradan ﵁ rəvayət etmişdir ki, o, Həsən ibn Əli ﵁ ilə qarşılaşdığı zaman belə demişdir: “Mən Peyğəmbərin ﷺ sənin qarnını öpdüyünü görmüşəm. Rəsulullahın ﷺ öpdüyü həmin yeri aç mən də oradan öpüm.” Həsən qarnını açdı və o da gəlib aradan öpdü.”[3]

Zəhəbinin “Siyər Əlam ən-Nubələ” əsərində İbn İshaq rəvayət edir ki, Əbu Hureyra ﵁ Həsən ﵁ vəfat etdiyi gün ağlayaraq yüksək səslə deyirdi: “Ey insanlar, bu gün Rəsulullahın ﷺ ən sevdiyi şəxs dünyasını dəyişib, ağlayın.”[4]

“Siyər Əlam ən-Nubələ” əsərində həmçinin Əbu əl-Muhəzzəmdən belə rəvayət olunur: “Bir dəfə biz cənazə mərasimində olarkən Əbu Hureyra ﵁ gəlib Hüseynin ﵁ ayağına batmış torpağı çırpmağa başladı.” [5] Əgər biz onların arasındakı yaş fərqini anlamış olsaq başa düşərik ki, Əbu Hureyranı ﵁ buna vadar

---

[1] Buxarinin “Səhih” əsəri, “Şirniyyat və bal” fəsli, № 3708

[2] Əbu Yələnin “Musnəd” əsəri № 6561. Kitabı təhqiq edən Hüseyn Səlim Əsəd bu hədisin isnadının “Səhih” olduğunu demişdir

[3] Hakimin “Mustədrək” əsəri, № 4785; Əhmədin “Musnəd” əsəri, № 9342; əl-Arnaut hədisin isnadının səhih olduğunu bildirmişdir. Tirmizi № 3764; Şeyx Albani hədisin məvquf olaraq səhih olduğunu bildirmişdir

[4] “Siyər Əlam ən-Nubələ” əsəri, 3/277

[5] “Siyər Əlam ən-Nubələ” əsəri, 3/287

edən, yalnız Hüseynə qarşı bəslədiyi sevgisi, hörməti və onun yüksək məqam sahibi olmasını bilməsi idi.

## Zeyd ibn Sabitin verdiyi təriflər

Zeyd ibn Sabitin İbn Abbasa qarşı bəslədiyi ehtirama dəlil olaraq İbn Abbasın onun miniyinin yüyənindən tutmasına icazə verməməsini göstərmək olar. İbn Abbasdan rəvayət olunur ki, o, Zeyd ibn Sabitin miniyinin yüyənindən tutarkən Zeyd dedi: "Kənara çəkil ey Peyğəmbərin əmisi oğlu." İbn Abbas dedi: "Həqiqətən biz öz böyüklərimizələ və alimlərimizələ belə rəftar edirik."[1]

## Ənəs, Bəra ibn Azib və Əbu Səid əl-Xudrinin Peyğəmbərin əhli-beytinə verdikləri təriflər

Bəra ibn Azib, Əbu Səid əl-Xudri və Ənəs ibn Malik əhli-beytin vəsflərini və fəzilətlərini bildikləri üçün onlar barədə xoş sözlər söyləməklə onlara qarşı bəslədikləri sevgini izhar etmişlər.

Rəvayət olunur ki, Ənəs ibn Malik demişdir: "Həsən ibn Əlidən daha çox Peyğəmbərə bənzəyən bir kəs yox idi."[2]

**Bəra ibn Azib:**

Tirmizinin nəql etdiyi hədisdə Bəra ibn Azib demişdir: "Bir dəfə Peyğəmbər Həsənlə Hüseynə baxıb dedi: "Allahım, mən onları sevirəm, sən də onları sev."[3]

**Əbu Səid əl-Xudri:**

Əhmədin öz isnadı ilə Əbu Səid əl-Xudridən rəvayət etdiyi hədisdə Rəsulullah demişdir: "Həsənlə Hüseyn Cənnət əhlinin cavanlarının hörmətliləridir."[4]

---

[1] Hakimin "Mustədrək" əsəri, 3/478, № 5785; Hədis Muslimin şərtlərinə görə səhihdir

[2] Buxarinin "Səhih" əsəri, "Səhabələrin fəzilətləri" kitabı, "Həsən və Hüseynin tərifəlayiq xüsusiyyətləri" fəsli, № 3542

[3] Tirmizinin "Sünən" əsəri, "Tərifəlayiq xüsusiyyətlər" kitabı, "Həsən və Hüseynin tərifəlayiq xüsusiyyətləri" fəsli, № 3782. Tirmizi bu hədisin "Həsən səhih" olduğunu demişdir

[4] İmam Əhmədin "Musnəd" əsəri, № 11794, Əbu Səid əl-Xudrinin rəvayəti; Tirmizinin "Sünən" əsəri, "Tərifəlayiq xüsusiyyətlər" kitabı, № 3781, "Hə-

## Abdullah ibn Amr ibn əl-Asın رضي الله عنه verdiyi təriflər

Abdullah ibn Amr ibn əl-As رضي الله عنه Rəca ibn Rabiədən nəql olunan rəvayətdə Hüseyn ibn Əlini رضي الله عنه tərif etmişdir. Racə ibn Rabiə demişdir: "Bir dəfə mən Rəsulullahın ﷺ məscidində ikən Hüseyn bin Əli رضي الله عنه gəlib salam verdi. İnsanlar da onun salamını aldılar. Abdullah ibn Amr isə dinmədi. İnsanlar salam verdikdən sonra isə o, yüksək səslə: "Sənə də Allahın salamı, rəhməti və bərəkəti olsun!" – dedi. Sonra o, üzünü insanlara çevirib dedi: "Sizə göy əhlinin yer əhlindən daha çox kimi sevdiyini xəbər verimmi?" İnsanlar: "Bəli!" – deyə cavab verdilər. O, dedi: "Baxın həmin adam bu möhtərəmdir. Vallahi ki, Sıffin gecələrindən sonra nə mən onunla bir kəlmə kəsmişəm, nə də o mənimlə bir kəlmə kəsmişdir. Allaha and olsun ki, onun məndən razı olması mənim üçün Uhud dağı boyda qızıldan daha sevimlidir." Əbu Səid əl-Xudri ona dedi: "Onun yanına getmək istəyirsənmi?" O, dedi: "Bəli." Beləcə onun yanına getmək barədə sözləşdilər. Mən də onlarla getdim. Əbu Səid izin istədi və ona izin verildi. Əbu Səidlə mən içəri daxil olduq. Sonra Əbu Səib İbn Amr üçün də izin istədi. O Abdullah ibn Amr üçün o qədər izin istədi ki, nəhayət Hüseyn ona izin verdi. İbn Amr da içəri daxil oldu. Bu zaman Əbu Səid Hüseynin yanında əyləşmişdi. O İbn Amrı gördükdə kənara çəkildi ki, *gəlib Hüseynin yanında əyləşsin*. Amma Hüseyn Əbu Səidi üzünə tərəf çəkdi. Belə olduqda İbn Amr oturmayıb ayaq üstə qaldı. Bunu gördükdə Hüseyn Əbu Səiddən bir az aralı çəkilərək İbn Amr üçün yer ayırdı. Beləcə İbn Amr gəlib onların arasında oturdu. Əbu Səid əhvalatı danışdıqda Hüseyn dedi: "Elədirmi, ey İbn Amr? Doğrudanmı səma əhlinin yer əhlindən ən çox sevdiyi şəxs mənəm?" İbn Amr dedi: "Bəli! Kəbənin Rəbbinə and olsun ki, elədir. Həqiqətən də sən səma əhlinin yer əhlindən ən çox sevdiyi şəxssən." Hüseyn soruşdu: "Bəs səni Sıffin günü mənə və atama qarşı döyüşməyə vadar edən nə oldu? Vallahi ki, atam məndən də xeyirli insandır."

---

sən və Hüseyn رضي الله عنهما Cənnət əhlinin cavanlarının hörmətliləridir" fəsli, Huzeyfənin رضي الله عنه rəvayəti

İbn Amr dedi: "Doğrudur! Lakin atam Amr məndən Peyğəmbərə ﷺ şikayət etmişdi ki, Abdullah gündüzlər oruc tutur, gecələr isə ibadət edir. Peyğəmbər ﷺ də mənə belə buyurmuşdu: "Gecənin bir hissəsini namaz qıl, bir hissəsini isə yat. Hərdən oruc tut, hərdən isə tutma. Bir də *atan* Amra itaət et."

Sıffin günü isə o Allaha and verdi ki, onlara qarşı şiddət göstərim, qılınc çəkim, nizə və ya ox atım. Hüseyn dedi: "Məgər sən bilmirsən ki, Xaliqə asi olaraq məxuqa itaət etmək olmaz?" İbn Amr dedi: "Bilirəm." Sanki *Hüseyn* onun *üzrünü* qəbul etdi."[1]

## Müaviyənin Əliyə və əhli-beytə رضي الله عنهم verdiyi fəriflər

Burada Müaviyənin əhli-beyt barədə söylədiyi tərifləri sübut edən bəzi dəlilləri görə bilərik. İbn Abdulbərrin "əl-İstiyab" əsərində rəvayət olunur ki, Müaviyə رضي الله عنه çətin vəziyyətlərə düşdüyü zaman Əli ibn Əbu Talibə رضي الله عنه məktub yazıb bu vəziyyətdən çıxması üçün ondan məsləhət istəyərdi. Elə ki, Əlinin ölüm xəbəri ona çatdı o belə dedi: "Əbu Talibin oğlunun ölümü ilə fiqh də əldən getdi, elm də."[2]

İmam Əhməd öz isnadı ilə Müaviyənin رضي الله عنه belə dediyini rəvayət etmişdir: "Bir dəfə mən gördüm ki, Rəsulullah ﷺ Həsən ibn Əlinin رضي الله عنهما dilini və ya dodaqlarını sovurur. Şübhəsiz ki, Rəsulullahın ﷺ sovurduğu dil və ya dodaqlara əsla əzab olunmaz."[3]

---

[1] "Məcməuz-Zəvaid" əsəri, 9/299, № 15109. Heysəmi demişdir: "Bu hədisi Təbərani "əl-Mocəm əl-Əvsat" əsərində rəvayət etmişdir. Hədisin isnadındakı Əli ibn Səid ibn Bəşir "Leyyin" ravi olması ilə bərabər "Hafiz"-dir. Hədisin isnadındakı digər ravilər isə etibarlı ravilərdir." Həmçinin Heysəmi "Məcməuz-Zəvaid" əsərində, 9/281 demişdir: "Bu hədisi Bəzzar Həsən ibn Əlidən رضي الله عنهما rəvayət etmişdir. Haşim ibn Bəriddən başqa bu rəvayətdəki ravilərin hamısı Buxarinin raviləridir. Haşim ibn Bəridə gəldikdə o da etibarlı ravidir."

Əksər hallarda Həsən və Hüseyn رضي الله عنهما eyni bir fəzilətdə və tərifəlayiq xüsusiyyətdə şərik olurlar. Əlbəttə iki buna onların hər ikisi layiqdir.

[2] "əl-İstiyab" əsəri, 1871 saylı tərcümeyi hal

[3] İmam Əhmədin "Musnəd" əsəri, № 16894. Şeyx əl-Arnaut hədisin isnadının "Səhih" olduğunu demişdir

əl-Əsbağ ibn Nəbatənin belə dediyi rəvayət olunur: "Bir dəfə Dirar ibn Damra ən-Nəhşəli Müaviyə ibn Əbu Sufyanın yanına daxil olduqda Müaviyə dedi: "Mənə Əlini vəsf et!" Dirar dedi: "Məni əfv edirsənmi?" O dedi: "Xeyir! Amma Əlini mənə vəsf et." O dedi: "Allah Əliyə rəhm etsin! Vallahi ki, o, bizim aramızda olarkən bizdən fərqlənmirdi. Onun yanına gəldikdə yaxınımızda durar, sual verdikdə cavab verər, ziyarət etdikdə də bizə yaxınlaşardı. Bizim qapımız heç vaxt onun üzünə bağlı olmaz, habelə, bizimlə onun arasında heç bir pərdə olmazdı. Vallahi ki, biz ona yaxın olmağımıza rəğmən onun heybətindən onunla danışmazdıq. Əzəməti səbəbindən onunla söhbətə başlamazdıq. O, təbəssüm etdikdə sanki sıra ilə düzülmüş mirvarilər parlayırdı."

Müaviyə dedi: "Onu yenə vəsf et!" Dirar dedi: "Allah Əliyə rəhmət eləsin! Vallahi ki, o, az yatar, çox ibadət edər, gecə-gündüz Allahın kitabını oxuyardı."

Bunu eşitdikdə Müaviyə ağlamağa başladı və dedi: "Kifayətdir ey Dirar! Allaha and olsun ki, Əli söylədiyin kimi idi. Allah Əbu Həsənə rəhmət eləsin!"[1]

İbn Kəsir "əl-Bidayə vən-Nihayə" əsərində İkrimənin belə dediyini rəvayət etmişdir: "İbn Abbas ﷺ vəfat etdikdə mən Müaviyənin ﷺ belə dediyini eşitdim: "Yaşayanlar və ölüb getmişlər arasında ən çox bilən şəxs vəfat etdi."[2]

Zəhəbinin "Siyər Əlam ən-Nubələ" əsərində rəvayət edilir ki, bir dəfə Yezid ibn Müaviyə Həsən ibn Əlinin yanında öyünməyə başladı. Bu zaman atası ona dedi: "Sən Həsənin yanındamı öyünürsən?" O, "Bəli" – deyə cavab verdi. Onda Müaviyə belə dedi: "Bəlkə elə düşünürsən ki, sənin anan onun anası kimi və ya baban da onun babası kimidir?"[3]

Həmçinin "Siyər" əsərində İbn Əbu Şeybədən rəvayət edilir ki, bir dəfə Həsən ﷺ Müaviyənin ﷺ yanına daxil olduqda Müaviyə ona dedi: "Sənə elə bir mükafat verəcəyəm ki, bənzərini heç ki-

---

[1] "Bihar əl-Ənvar" əsəri, 41/14; "Əmali əs-Səduq" əsəri, 624
[2] "əl-Bidayə vən-Nihayə" əsəri, 8/301
[3] "Siyər Əlam ən-Nubələ" əsəri, 3/260

mə verməmişəm." Beləliklə ona dörd yüz min verdi, o da bunu *ondan* qəbul etdi.[1]

İbn Əsakirin "Tarix Diməşq" əsərində Müaviyənin ﷺ Abdullah ibn Cəfəri ﷺ tərif etdiyi rəvayət olunur. Belə ki, Abdulmalik ibn Marvan demişdir: "Mən atamın belə dediyini eşitmişəm: "Mən Müaviyənin ﷺ belə dediyini eşitmişəm: "Haşimi oğulları iki şəxsdəndir: Ən xeyirli insan Rəsulullah ﷺ, bir də şərəfli bir insan olan Abdullah ibn Cəfər ﷺ. Vallahi ki, onunla şərəf məsələsində yarışan elə bir insan yoxdur ki, onları qabaqlamış olmasın. Şübhəsiz ki, o Peyğəmbərin ﷺ taxçasıdır. Vallahi ki, sanki şöhrət heç kəsin çata bilmədiyi bir yerə düşüb, Abdullah da onun ortasına nazil olub."[2]

## Son söz

Bütün bu mübarək dəlillərə nəzər saldıqdan sonra aydın olur ki, səhabələrlə əhli-beyt ﷺ arasında möhkəm əlaqələr olmuşdur. Onlar bir-birilərinə qarşı yalnız sevgi və ehtiram hisləri bəsləmiş, habelə Allah rizası üçün və Rəsulullahın ﷺ hüququ naminə dini və din əhlini sevmişlər.

Odur ki, dininə və imanına həris olan hər kəs bilsin ki, əhli-beyti və səhabələri sevmək fərz və vacibdir. Onlar barədə nalayiq sözlər işlətmək isə onların getdiyi yoldan uzaqlaşmaq və özünü əzaba məruz etmək anlamındadır. Allahın əzabından qorxan və savaba nail olmaq istəyən kəslər üçün bu qeyd olunanlar bir xatırlatmadır. Şübhəsiz ki, son dönüşümüz Allaha olacaqdır.

Allahım onları sevməyi və onlara tabe olmağı bizlərə nəsib et! Habelə bizləri onlarla birlikdə həşr et... Amin.

---

[1] "Siyər Əlam ən-Nubələ" əsəri, 3/269; Əsəri təhqiq edən alim onun isnadının həsən olduğunu bildirmişdir

[2] "Tarix Diməşq" əsəri, 29/179; Bu rəvayətin bir incəliyi də ondan ibarətdir ki, onun isnadında Müaviyə, Mərvan və Abdulmalik kimi üç xəlifədə ardıcıl zikr olunur

# Məxəzlər


1. əl-Mufidin **“əl-İrşad”** əsəri – əl-Mufidin əsərləri silsiləsindən – əl-Mufid yayım evi – Beyrut, İkinci nəşr hicri: 1414.
2. əs-Səxavinin **“İsticlab İrtiqa əl-Ğuraf”** əsəri – əl-Bəşair əl-İslamiyyə yayım evi – Beyrut, 2000-ci il – Xalid Əhməd əs-Summinin təhqiqi.
3. **“əl-İstiyab fi Mərifəti əl-Əshab”** əsəri – İbn Abdulbərr əl-Əndəlusi.
4. əl-Məclisinin **“Bihar əl-Ənvar”** əsəri – əl-İhya ət-Turas əl-Ərabi yayım evi – Beyrut, üçüncü nəşr, hicri: 1403.
5. İbn Kəsir əd-Diməşqinin **“əl-Bidayə van-Nihayə”** əsəri – əl-Məarif nəşriyyatı – Beyrut, hicri: 1415.
6. Təbərinin **“Tarix əl-Uməm vəl-Muluk”** əsəri – Beyrut, Livan – üçüncü nəşr, hicri: 1403 – Əbul-Fadl İbrahimin təhqiqi.
7. İbn Əsakirin **“Tarix Diməşq”** əsəri – İyha ət-Turas əl-Ərabi yayım evi – Beyrut, birinci nəşr hicri: 1421.
8. əl-İmtrabadi ən-Nəcəfinin **“Təvil əl-Əyat fi Fədail əl-İtratu ət-Tahira”** əsəri – İmam Mehdi mədrəsəsi – Birinci nəşr, hicri 1407.
9. İmam əl-Əskərinin **“Təfsir”** əsəri – İmam Mehdi mədrəsəsinin təhqiqi – Birinci nəşr, hicri: 1409, Qum.
10. İbn Babaveyh əl-Qumminin **“əl-Xisal”** əsəri – Əli Əkbər Ğifarinin təhqiqi – Qum şəhərində bir qrup müəllim.
11. əl-Albaninin **“Silsilətu əl-Əhadis əs-Səhihə”** əsəri – əl-Məarif nəşriyyatı – ər-Riyad – Hicri: 1422, miladi: 2002.
12. Əbu Davud əs-Sicistaninin **“Sünən”** əsəri – Darus-Salam yayım evi – ər-Riyad, miladi: 2001.
13. Muhəmməd ibn İsa ət-Tirmizinin **“Sünən”** əsəri – Darus-Salam yayım evi – ər-Riyad, miladi: 2001.
14. əz-Zəhəbinin **“Siyər Əlam ən-Nubələ”** əsəri – Darur-Risalə yayım evi – Beyrut – On birinci nəşr, miladi: 2001.
15. İbn Hibban əl-Bustinin **“Səhih İbn Hibban”** əsəri – ər-Risalə müəssisəsi – Beyrut, ikinci nəşr, hicri: 1414. Şüeyb əl-Arnautun təhqiqi.

16. Buxarinin **"Səhih"** əsəri – Darus-Salam yayım evi – İkinci nəşr, ər-Riyad.
17. İmam Muslim ibn Həccacın **"Səhih"** əsəri – Darus-Salam yayım evi – İkinci nəşr, ər-Riyad.
18. İmam Zeynulabidinin **"əs-Sahifətu əs-Səccadiyyə əl-Kamilə"** əsəri.
19. Muhəmməd ibn Sədin **"ət-Təbəqat əl-Kubra"** əsəri – Darus-Sadir yayım evi – Beyrut.
20. Əhməd ibn Hənbəlin **"Fədail əs-Səhabə"** əsəri – İbn əl-Cəuzi yayım evi – ər-Riyad, ikinci nəşr, hicri: 1420.
21. əl-Kuleyninin **"əl-Kafi" (əl-Usul)** əsəri – Əli Əkbər Ğifarinin təhqiqi – Darul-Kutubul-İslamiyyə yayım evi – Üçüncü nəşr, hicri: 1388.
22. əl-Ərbilinin **"Kəşf əl-Ğummə fi Mərifəti əl-Əimmə"** əsəri – Darul-Adva yayım evi – Livan, hicri: 1421, miladi: 2000.
23. Heysəminin **"Məcməuz-Zəvaid"** əsəri – Darul-Fikr yayım evi – Beyrut, hicri: 1412, miladi: 2000.
24. əl-Məsudinin **"Muruc əz-Zəhəb"** əsəri.
25. Hakim ən-Nisaburinin **"Mustədrək"** əsəri – Darul-Kutubul-İlmiyyə yayım evi – Beyrut, birinci nəşr, hicri: 1411.
26. Əbu Yələ əl-Mousulinin **"Musnəd"** əsəri – Darul-Kutubul-Məmun yayım evi – Diməşq – Hüseyn Səlim Əsədin təhqiqi.
27. Əhməd ibn Hənbəlin **"Musnəd"** əsəri – Qurtuba müəssisəsi – Qahirə.
28. Əbu Bəkr ibn Əbu Şeybənin **"Musənnəf"** əsəri – ər-Ruşd nəşriyyatı – ər-Riyad, birinci nəşr, hicri: 1409 – Kamal Yusuf əl-Hutun təhqiqi.
29. Yaqut əl-Həmavinin **"Mucəm əl-Buldan"** əsəri – Darul-Fikr yayım evi – Beyrut.
30. **"Nəhc əl-Bəlağə"** əsəri – Muhəmməd Abdunun təhqiqi – Darul-Əndəlus yayım evi – Beyrut.

# Mündəricat